"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ




AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ



"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"
H.Əliyev

HEYDƏR ƏLİYEV 100

# ADPU - İnkişaf yolunda











ŞƏKİ FİLİALI
QUBA FİLİALI
ŞAMAXI FİLİALI
AĞCABƏDİ FİLİALI
CƏLİLABAD FİLİALI



BAKI
ADPU, Əsas tədris binası, Səbail kampusu. Üzeyir Hacıbəyli 68
ADPU, II saylı tədris binası, Gənclik kampusu. Akademik Həsən Əliyev 104
ADPU, III tədris binası, Nəsimi kampusu. Nəsibbəy Yusifbəyli 60
ADPU, IV tədris binası, Təbriz kampusu Koroğlu Rəhimov 13











*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Hesabat - İnkişaf yolunda, 2023 / № 2 (1120)

# “ƏNƏNƏLƏRƏ SADİQ, YENİLİKLƏRƏ AÇIQ UNİVERSİTET!”

Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Azərbaycan Xalq Komissarları Sovetinin (XKS) sədri Nərman Nərimanovun imzaladığı 1921-ci il 26 avqust tarixli dekret əsasında 6 nəfər tələbə ilə milli dildə fəaliyyətə başlayan ilk ali təhsil ocağıdır. Böyük tarixi inkişaf yolu keçən Azərbaycan Dövlət Pedaqoji İnstitutu XX əsrin 90-cı illərində Azərbaycan Dövlət Pedaqoji Universiteti adını almışdır. Fəaliyyəti dövründə ali təhsil ocağı 170 minə yaxın müəllim kadrı hazırlamış, bir çox ixtisaslar üzrə elmi-pedaqoji kadr hazırlığının mərkəzinə çevrilmişdir.

ADPU təhsilin subbakalavriat, bakalavriatura, magistratura və doktorantura səviyyələri, o cümlədən əlavə təhsil üzrə təhsil proqramlarını həyata keçirən geniş şəbəkəyə malik dövlət ali təhsil müəssisəsidir. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12 avqust 2022-ci il tarixli 302 nömrəli "Azərbaycan Dövlət Pedaqoji Universitetinin yenidən təşkili və Nizamnaməsinin təsdiq edilməsi haqqında" Qərarı ilə universitet Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin tabeliyində publik hüquqi şəxs statusu almışdır.

2021-ci ildə 100 illiyini qeyd edən ADPU tarixi inkişaf yolu keçmiş, ölkədə təhsilin və müəllim kadrlarının hazırlanmasında böyük xidmətlər göstərmişdir. XX əsrin 50-60-cı illərində M.Muradxanov, Ə.Zəkuzadə və Ə.Əbdülrəhmanova professor elmi adının verilməsi, professor A.Abbaszadənin RSFSR PEA-nın müxbir üzvü, M.Mehdizadənin SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü seçilməsi böyük elmi hadisə kimi gənc elmi kadrların inkişafına təkan verən əsas amilə çevrilmişdir. Fəxrlə deyə bilərik ki, SSRİ PEA-nın həqiqi və müxbir üzvü seçilən azərbaycanlı alimlər – M.Mehdizadə, A.Abbaszadə, H.Əhmədov, S.İmanov məhz ADPU-nun əməkdaşları olmuşlar. Xüsusilə vurğulamaq lazımdır ki, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) on iki prezidentinin dördü – Yusif Məmmədəliyev (iki dəfə), Zahid Xəlilov, Həsən Abdullayev və İsa Həbibbəyli ADPU-nun məzunlarıdır.






Pedaqogika və psixologiya, riyaziyyat, kimya, tarix, filologiya, fəlsəfə və başqa sahələr üzrə elmi məktəblər və istiqamətlər məhz ADPU-da yaradılıb, inkişaf edib.

Xalqımızın fəxr etdiyi yüzlərlə tanınmış alim, yaradıcı ziyalı, ictimai və dövlət xadimi ADPU-da təhsil almışdır. Universitetin məzunlarından Y.Məmmədəliyev, H.Hüseynov, Z.Xəlilov, H.Abdullayev, M.Rəsulov, Ə.Hüseynov, İ.Hüseynov, S.Rəhimov, Ş.Qurbanov, A.Qarayev, Ə.Sumbatzadə, M.Dadaşzadə, M.Cəfərov, İ.İbrahimov, M.Şirəliyev, İ.Şıxlı, H.Əmirxanov kimi tanınmış elm və mədəniyyət xadimləri çoxdan xalqımızın elm və şöhrət simvollarına çevrilmişlər. Onların ayrı-ayrılıqda hər birinin adı xarici ölkələrdə keçirilən beynəlxalq səviyyəli nüfuzlu elmi tədbirlərdə böyük iftixarla çəkilir. Sovet İttifaqı Qəhrəmanları – Mehdi Hüseynzadə, Xıdır Mustafayev, Fariz Səfərov, Səlahəddin Kazımov, Sosialist Əməyi Qəhrəmanları – Səfa İmanov, Zərbəli Səmədov, Rüstəm Səfərəliyev, Azərbaycanın Milli Qəhrəmanları – Mirələkbər İbrahimov, Mətləb Quliyev, Şakir Salahov, “Zəfər” ordenli Əli Nağıyev, “Azərbaycan Bayrağı” ordenli Malik Bayramov, Orxan Nəbiyev, Firdovsi Tahirov igidlik, hünər, vətənpərvərlik rəmzi kimi xatırlanırlar. Universitet məzunlarından 13 nəfəri, habelə savaşın yeganə xanım şəhidi Arəstə Baxışova Vətən mübaribəsində canlarından keçiblər.

ADPU-nun məzunları müxtəlif ali məktəblərdə, elmi-tədqiqat institutlarında, dövlət təşkilatlarında uğurla fəaliyyət göstərirlər. Ulu Öndər Heydər Əliyev müxtəlif illərdə 5 dəfə ADPU-da olub. ADPU-nun foyesində Ulu Öndərin abidəsi qoyulub, nadir eksponatları sərgiləndiyi Heydər Əliyev Muzeyi yaradılıb. Zəngin irsinin gənc nəslə çatdırılması məqsədilə “Heydər Əliyev məktəbinin lektoriyası” təşkil edilib, ADPU-nun 2 saylı tədris binasında möhtəşəm Heydər Əliyev Mərkəzi yaradılıb.

## İDARƏETMƏ

Azərbaycan Respublikası Prezidentinin 23 iyun 2016-cı il tarixli Sərəncamı ilə professor Cəfər Cəfərov ADPU-ya rektor təyin edilmişdir.

Hazırda ADPU publik hüquqi şəxs olaraq Bakıda beş tədris binasında təhsil verməklə bərabər, ölkənin 5 müxtəlif regionunda universitetin Şəki, Quba, Ağcabədi, Cəlilabad və Şamaxı filialları fəaliyyət göstərir. Həmçinin Bakıda iki korpusda ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci orta ixtisas təhsili xidməti göstərməkdədir.

ADPU-da ali idarəetmə orqanı Elmi Şuradır. ADPU-nun yeni Nizamnaməsinə görə strateji inkişaf məsələləri üzrə idarəetmə orqanı olan ictimai əsaslarla fəaliyyət göstərən Himayəçilər Şurasının yaradılması nəzərdə tutulub. Yaxın vaxtlarda Himayəçilər Şurasının üzvlərinin Elm və Təhsil Nazirliyi tərəfindən təyin olunması gözlənilir. Tərkibdə işəgötürənlərin və ictimaiyyət nümayənlərinin də olması nəzərdə tutulur.




























Hazırda ADPU-da Filologiya, Tarix və coğrafiya, Riyaziyyat, Kimya və biologiya, Fizika, Məktəbəqədər təhsil, İncəsənət və fiziki tərbiyə, İbtidai təhsil fakültələri olmaqla, 8 fakültə fəaliyyət göstərir. Eyni zamanda Universitetdə Magistratura və doktorantura şöbəsi, Davamlı təhsil və innovasiyalar bölməsi, həmçinin SABAH Mərkəzi fəaliyyət göstərir. Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb 2016-2017-ci tədris ilindən etibarən ADPU-nun baza məktəbi kimi fəaliyyət göstərir.

Baş verən struktur dəyişiklikləri nəticəsində ADPU-nun fəaliyyət dairəsi genişlənib, professor-müəllim heyətinin və tələbə kontingentinin sayı xeyli artıb. Belə ki, ADPU ailəsi 2022/2023-cü tədris ilinə filiallar və Pedaqoji Kolleclə birlikdə 21.566 nəfərlə başlamışdır. Universitetdə 59 elmlər doktoru, 46 professor, 247 dosent, 379 fəlsəfə doktoru çalışır. ADPU-da ali təhsilin bakalavriat səviyyəsində 22 ixtisas, magistratura səviyyəsində 22 ixtisas (28 ixtisaslaşma) və doktorantura səviyyəsində isə 10 elm sahəsi üzrə 33 ixtisaslaşma üzrə elmi-pedaqoji kadr hazırlanır ***(son səhifəyə bax).***

ADPU beynəlxalq reytinq üzrə Webometrics platformasında dünya reytinqində 8039-cu, kontinental reytinqdə 2027-ci, ölkə reytinqində 10-cu, dünyada impakta görə 17748-ci, açıqlığa görə 7521-ci, mükəmməliyə görə isə 5538-ci yerdədir.

Universitet Azərbaycan üzrə impakta görə 26-cı, açıqlığa görə 5-ci, mükəmməliyə görə isə 7-ci yerdədir. 2022-ci ildə ADPU tələbə qəbulunun nəticələrinə görə qəbul planını tam doldurmuş 6 ali təhsil müəssisəsindən biridir.

Universitetin 4 professoru əməkdar elm xadimidir. ADPU-nun 100 illik yubileyi ilə bağlı universitetin 1 əməkdaşı "Şöhrət" ordeni, 6 əməkdaşı 3-cü dərəcəli "Əmək" ordeni, 17 nəfər əməkdaşı "Tərəqqi" medalı, 1 əməkdaşı Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdü, 4 əməkdaşı Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu, 24 əməkdaşı isə "Əməkdar müəllim" fəxri adı ilə təltif olunub. O cümlədən 87 əməkdaş "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanı və 79 əməkdaşı isə Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri Fərmanı ilə təltif olunub. Həmçinin Azərbaycan Respublikası Prezidentinin 27 dekabr 2021-ci il tarixli Fərmanı ilə "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" Azərbaycan Respublikasının yubiley medalı təsis edilib.




Fəaliyyətinin ikinci yüzilliyinə daxil olan Pedaqoji Universitet öz inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoymuşdur. Hazırda ADPU-da şəffaf və obyektiv təhsil mühitinin yaradılması, yeniliyin və müasirliyin təmin edilməsi, qabaqcıl beynəlxalq təcrübənin öyrənilərək tətbiq olunması, bazar iqtisadiyyatının tələblərinə uyğun rəqabətqabiliyyətli mütəxəssislərin hazırlanması əsas vəzifələrdir. Müasir əmək bazarının tələbləri öyrənilməli və bu tələblərə cavab verə biləcək pedaqoji kadrların hazırlanması istiqamətində səmərəli və məqsədyönlü iş aparılması əsas fəaliyyət istiqamətlərindəndir. Qarşıdakı dövrdə "ADPU 2030 İnkişaf Strategiyası"nın formalaşdırılması nəzərdə tutulur.



## AKADEMİK HEYƏT (2023)

| PROFESSOR-MÜƏLLİM, ELMİ İŞÇİ | ELMLƏR DOKTORU | FƏLSƏFƏ DOKTORU | PROFESSOR | DOSENT |
|---|---|---|---|---|
| 675 | 59 | 379 | 46 | 247 |

## STRATEJİ İNKİŞAF

ADPU-nun 2018-2021-ci illər üzrə Strateji İnkişaf Planı (SİP) hazırlanmışdır. SİP-də müəyyən edilən məqsəd və hədəflər ADPU-nun "Milli şüura malik tədqiqatçı, məhsuldar, dərin düşüncəli, elmə, insan hüquqlarına hörmət edən, yaradıcı və innovativ, fərdlər - pedaqoqlar yetişdirmək və təhsil, tərbiyə, araşdırma və s. digər elmi tədbirlər vasitəsilə cəmiyyətin texnoloji, sosial-iqtisadi və mədəni səviyyəsinin yüksəldilməsinə töhfə vermək" missiyasına uyğun müəyyən edilmişdir. Bu SİP yuxarıda qeyd olunanlar işığında 2021-ci ilədək olan dövrdə müəyyənləşmiş inkişaf istiqamətləri üzrə əsas hədəflərə yönəlməyə, nəticəyə istiqamətlənmiş idarəetmənin daha da gücləndirilməsinə xidmət etmişdir. Qeyd edək ki, ADPU-nun 2018-2021-ci illər üzrə Strateji İnkişaf Planının icrası Elmi Şuranın 29 dekabr 2022-ci il tarixli qərarı ilə 2023-cü ilin sonuna qədər uzadılmışdır. Elmi Şuranın 14 sentyabr 2022-ci il tarixli qərarı ilə "ADPU 2023-2030" Strateji İnkişaf Planının hazırlanması üzrə işçi qrup yaradılmışdır.

ADPU-nun son 6 ildə təhsilin keyfiyyətinin yaxşılaşdırılması, məzmunun yenilənməsi, professor-müəllim heyətinin səriştələrinin daha da gücləndirilməsi, müasirləşdirilməsi, tələbə məmnunluğunun artırılması, MİQ nəticələrinin yüksəldilməsi, yeni magistr proqramlarının açılması, SABAH qruplarının artırılması, SABAH magistratura proqramının, eksperimental qrupların yaradılması, Azərbaycan bölməsi ilə yanaşı, rus və ingilis bölmələrinin genişləndirilməsi, universitet müəllimlərinin elmi nəticələrinin keyfiyyətinin artması, beynəlxalq tədqiqatlara cəlb olunması, yeni innovativ layihələrin həyata keçirilməsi, beynəlxalq əlaqələrin, ikili diplom proqramlarının yaradılması və s. sahələrdə görülmüş işlər missiya və gələcəyə baxışdan irəli gələn, əmək bazarının və təhsil sisteminin ehtiyaclarından doğan reallıqlar olmuşdur.

Həmçinin professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi sisteminin, daxili institusional qiymətləndirmənin tətbiqi, Elm və Təhsil Nazirliyi ilə birgə illik iş planı, əqli mülkiyyətin qorunması sisteminin (antiplagiat) qurulması, təhsilin inklüzivləşdirilməsi siyasətinə dəstək (YUNİSEF və RİİB ilə layihələr), qısamüddətli təlim proqramları, mobillik imkanları bu yenilənmə prosesində istifadə edilmiş əsas alətlərdən olmuşdur.









Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayevin 25 iyun 2021-ci ildə imzaladığı müvafiq əmrlə Azərbaycan Dövlət Pedaqoji Universitetində Strateji inkişaf məsələləri üzrə prorektorluq yaradılmışdır. Elmi Şuranın 07 oktyabr 2021-ci il tarixli qərarı ilə Strateji inkişaf məsələləri üzrə prorektorluğun nəzdində Strateji İnkişaf Mərkəzi təsis edilib.

Mərkəz tərəfindən tələbə məmnuniyyətinin ölçülməsi və dərslərin daha səmərəli təşkil edilməsi məqsədilə mütəmadi olaraq tələbə və professor-müəllim heyəti arasında sorğular təşkil olunur. Sorğu nəticələri təhlil olunaraq müvafiq addımların atılması təmin edilir.

Ölkəmizdə keçirilən beynəlxalq şagird qiymətləndirmələri və tədqiqatlar Strateji İnkişaf Mərkəzi tərəfindən icra edilir. Belə ki, TIMSS, ICILS, PISA, PIRLS beynəlxalq şagird qiymətləndirmələri və TALIS - Təlim və Tədris üzrə Beynəlxalq Araşdırma tədqiqatı üzrə öyrənən və öyrədənlər üçün təlimlərin təşkili, pilot, sınaq və əsas mərhələlər mərkəzin əməkdaşları tərəfindən həyata keçirilir. Mərkəz tərəfindən tələbələr ölkəmizin qoşulduğu beynəlxalq qiymətləndirmələr haqqında məlumatlandırılır və bu sahədə müxtəlif fəaliyyətlərə cəlb olunurlar. Qeyd edək ki, SİM ölkəmizdə fəaliyyət göstərən bir çox qurum və təşkilatlarla - ETN, BŞTİ, ARTİ, Alqoritmika şirkəti, T-Network, AGMA (Azərbaycan Gənc Müəllimlər Assosasiyası), "Bir Könüllü" və s. ilə ortaq layihələr həyata keçirir. 2022-ci ildən etibarən Elm və Təhsil Nazirliyinin ADPU SİM ilə birgə gələcəkdə dövlət ümumi təhsil müəssisələrində direktor vəzifəsində çalışmaq arzusunda olan pedaqoji kadrlar üçün "Məktəb Liderliyi Proqramı" (MLP) təşkil olunur. Proqramın ilk çağırışı üzrə 50 nəfər məzun olub.

ADPU SİM tərəfindən AGMA ilə əməkdaşlıq çərçivəsində gənc müəllimlər üçün bir sıra modullar üzrə e-təlim materialları hazırlanıb.






# KEYFİYYƏT TƏMİNATI

## KEYFİYYƏT TƏMİNATI SİYASƏTİ

Universitet 2018-ci ildə Avropa komissiyasının Erasmus+ proqramı çərçivəsində "Azərbaycan Universitetlərində Keyfiyyətin Təminatı (KT) Mərkəzlərinin Yaradılması və İnkişaf Etdirilməsi (EQAC)" adlı üç illik layihəsinə qoşulmuşdur. Bu layihə çərçivəsində universitetdə daxili keyfiyyət sistemi institusional səviyyədə qurulmuşdur. Layihə çərçivəsində Universitetin Elmi Şurasının 14 sentyabr 2018-ci il tarixli iclasının qərarı ilə ADPU-da Keyfiyyət Siyasəti sənədi təsdiq edilmişdir Sənədin hazırlanmasında Ankara Universitetinin, Qars Universitetinin, Qlazqo Universitetinin və s. inkişaf etmiş ölkələrin, habelə Türkiyənin YÖKAK təşkilatının sənədlərinin təhlilindən istifadə olunmuşdur. ADPU-nun keyfiyyət təminatını müəyyən edən missiyası, vizyonu və prinsipləri vardır. Missiya, əsasən universitetdə keyfiyyətin artırılması və davamlı təkmilləşdirilməsi yolu ilə keyfiyyətli tədris, tədris planları, idarəetmə və tədqiqat işlərinin aparılması, habelə buna nail olmaq üçün ən yüksək keyfiyyətli sistem və prosedurların təmin edilməsi kimi fəaliyyətlərin həyata keçirilməsini əhatə edir. Bu fəaliyyətlər bilavasitə universitetin üstün bir təhsil müəssisəsinə çevrilməsi, habelə yerli və qlobal əmək bazarının tələblərinə cavab verən vətənpərvər, savadlı, yüksək peşə kompetensiyasına malik məzunların hazırlanmasına xidmət edir. ADPU-nun keyfiyyət təminatı sahəsində vizyonu belədir: ***"Keyfiyyətli təhsil və keyfiyyətli idarəetmə universitetin uğurunun qarantıdır".***

## DAXİLİ KEYFİYYƏT TƏMİNATI MEXANİZMLƏRİ

ADPU-da keyfiyyət təminatı sisteminin qurulmasında rəsmi sənədlər və beynəlxalq standartlarla yanaşı universitetin Keyfiyyət siyasəti sənədi, Strateji İnkişaf Planı və Nizamnaməsi, habelə daxili və xarici maraqlı tərəflərin rəy və təklifləri əsas götürülmüşdür. Universitetdə ESG standartlarının reallaşdırılması istiqamətində keyfiyyətin artırılması və struktur vahidləri arasında səmərəli kommunikasiyanın qurulması məqsədilə 2018-ci ildə Keyfiyyətin təminatı şöbəsi yaradılıb.

Şöbə universitetdə təhsil, tədris, professor-müəllim heyətinin dünya ilə müqayisədə rəqabətliliyinin artırılması, tələbələrin sosiallaşması və beynəlxalq aləmə inteqrasiya olunması, habelə universitetin mükəmməl idarəetmə sisteminin təşkili istiqamətlərində nəzarət və təhlillər həyata keçirir və bunun əsasında məqsədyönlü təkliflər hazırlayır.

EQAC layihəsi çərçivəsində ADPU-nun keyfiyyətin təminatı sahəsidə davamlı inkişaf planı hazırlanmışdır. Plana görə görüləcək işlərin arasında prioritet olaraq universitetin keyfiyyət təminatı sisteminin ISO 9001 standartları əsasında yaxşılaşdırılması nəzərdə tutulur.

3 dekabr 2018-ci il tarixindən ADPU-da mərkəzləşdirilmiş daxili keyfiyyət təminatı sistemini təmin edən kollegial qurum kimi Elmi Şuranın qərarı ilə rektorun rəhbərlik etdiyi Keyfiyyətin Təminatı Komissiyası fəaliyyət göstərir.

2021-ci ildən ADPU-nun beş filialında da Keyfiyyətin təminatı şöbələri fəaliyyətə başlayıb, universitetin bütün filialları və kollecini əhatə edən, Keyfiyyətin Təminatı Komissiyanın nəzdində Keyfiyyətin təminatı üzrə işçi qrup yaradılıb.

ADPU-da keyfiyyətin təminatı sistemi PDCA dövriyyə modeli əsasında qurulmuşdur:

1. Keyfiyyətin təminatı şöbəsi tərəfindən ESG-nin müəyyən standartları üzrə ölkədaxili və xarici universitetlər arasında müqayisəli təhlil aparılaraq problemlər müəyyən olunur. Onların aradan qaldırılması ilə bağlı təkmilləşdirmə planı hazırlanır.
2. Təkmilləşdirmə işləri fonunda yeniliklər tətbiq edilir.
3. Yeniliklərin səmərəliliyinin keyfiyyətə təsiri yoxlanılır və nəticələr təhlil olunur.
4. Nəticələr və meydana çıxan problemlər əsasında daxili keyfiyyət təminatı sistemi təkmilləşdirilir.

ADPU-da keyfiyyət təminatı ilə bağlı universitet üzrə sorğular, akademik heyətin reytinq qiymətləndirilməsinə dair sənədlərin toplanması və emalı prosesi aşağıdakı sxemə əsasən aparılır.




*ADPU-da Keyfiyyətin təminatı sistemi*

Bu sxem PDCA modeli əsasında innovativ ideyaların və təkliflərin həyata keçirilməsi, ADPU-da istənilən struktur vahidində (filiallar, fakültə, ADPK və s.) sistemli şəkildə keyfiyyətin təmin olunması prosesini həyata keçirməyə imkan verir.

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin**
**Strateji bəyannaməsi**

**Şüarı**

**"Ənənələrə sadiq, yeniliklərə açıq universitet!"**

**Gələcəyə baxışı (vizyonu)**

**"Beynəlxalq standartlara cavab verən tədqiqatçı-müəllim hazırlığını peşə təhsilinin əsasları, ixtisas və innovasiyalar istiqamətində həyata keçirmək".**

**Missiyası**

**"Milli şüura malik, tədqiqatçı, məhsuldar, dərin düşüncəli, elmə, insan hüquqlarına hörmət edən, yaradıcı və innovativ fərdlər – pedaqoqlar yetişdirmək; Təhsil, tərbiyə, araşdırma və s. vasitəsilə cəmiyyətin texnoloji, sosial-iqtisadi və mədəni səviyyəsinin yüksəldilməsinə töhfə vermək".**

**Əsas hədəfləri**

**- Tələbələr üçün universitet məmnunluğunu gücləndirmək (tələbə məmnunluğu sorğuları, müəllimlərin qiymətləndirilməsi kimi metodlar vasitəsilə);**
**- Tələbə nəticələrini yüksəltmək (universitetdənkənar imtahanlardan keçid səviyyəsi, işlə təmin olunma, ixtisasların qəbul yerlərinin dolma səviyyəsini və s. ölçməklə);**
**- Universitetə yüksək bacarıqlara malik tələbələri cəlb etmək (universitetə qəbul ballarının əsasında) və universitetə yüksək balla qəbul olunan tələbələrin bacarıqlarının tədqiqat-innovasiya istiqamətində inkişafına nail olmaq.**

**Əsas dəyərləri**

**- Bütövlük/şəffaflıq: ədalətli, vicdanlı və etik şəkildə davranmaq, universitetin bütün fəaliyyət və qərar qəbulu proseslərində güvən mədəniyyətini yaratmaq;**
**- Mükəmməllik: davamlı olaraq yüksək keyfiyyətli proqramlar, tədris, xidmət və təqaüd imkanları təqdim etməklə cəmiyyətin inkişafına xidmət göstərmək;**
**- İnnovasiya: fərdi yaradıcılıq və kreativliyi təşviq etməklə ideyaların inkişafını nəzərə almaq , dəstəkləmək, karyerada yüksəlmə və dəyişməyə, dinamikaya imkan verən mühit yaratmaq;**
**- Cavabdehlik: universitetə ayrılmış resursları səmərəli idarə etməklə akademik, proqram və maliyyə bütövlüyünü və dəyərini təmin etmək;**
**- Ehtiram: bütün fəaliyyət və qərar qəbulunda kollektiv olaraq hər kəsə insani, açıq və peşəkar yanaşmaq və müxtəlifliyə açıq olmaq;**
**- Əməkdaşlıq: komanda işi, korporativ mədəniyyət, iştirakçılıq, ideya və perspektivlərin müxtəlifliyinə dəyər verməklə ümumi məqsədlər uğrunda universitetin yerli (milli), regional və qlobal səviyyədə digər tərəfdaşlarla əməkdaşlığı.**

## KEYFİYYƏT TƏMİNATI MƏDƏNİYYƏTİ

Universitetin keyfiyyət təminatı mədəniyyəti təlim və tədris prosesinin keyfiyyətinə təsir edən təşkilati vərdişlərə, normalara, dəyərlərə və standartlara aiddir. Universitet rəhbərliyi keyfiyyət təminatı mədəniyyətini birbaşa idarə edə bilməz, çünki bu, akademik-inzibati heyətin ümumi təcrübəsindən irəli gəlir. Bununla yanaşı, universitetdə tələbələr arasında sorğuda iştiraketmə mədəniyyəti formalaşır. ADPU-da Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsi tərəfindən birinci tədris ilinin tələbələri arasında motivasiya sorğusu aparılır. Reytinq qiymətləndirilməsi çərçivəsində tələbənin müəllimlərdən məmnunluq sorğusunda 3 il ərzində təqribən 27.000-dən çox tələbə iştirak etmişdir.



Universitetdə akademik-inzibati heyətin fəaliyyətinin keyfiyyətini daimi artıran rəqabət mühiti yaradılmışdır. Professor-müəllim heyəti ilə tələbələr arasında qarşılıqlı mehriban münasibət mədəniyyəti formalaşmaqdadır. Bunun ən bariz nümunəsi kimi 2 ildir tələbələr arasında aparılan meqasorğunu göstərmək olar. Belə ki, Keyfiyyətin təminatı şöbəsi tərəfindən 2021-ci ildən başlayaraq hər ilin 30 mart – 19 aprel tarixlərində ADPU-da tədris, öyrənmə mühiti, təchizat və gözləntilərlə bağlı 60 sualdan ibarət "Tələbə Məmnuniyyəti" meqasorğusu keçirilir. Keçirilən sorğuların nəticələri təhlil olunaraq rektora təqdim edilmiş, Elmi Şurada geniş müzakirə olunmuşdur. Sorğuda 2021-ci ildə 2.976 nəfər, 2022-ci ildə isə 7.260 (kollec və filiallar da daxil olmaqla 8.964) tələbə iştirak etmişdir. 2 ilə görə nəticələr təqribən 1-2 % fərq ilə üst-üstə düşür. Meqasorğunun nəticələrinə əsasən, tələbələrin 70 %-i müəllimlərin fənnə aid biliyindən, fənni tədris etməyindən razıdırlar və onlara tədris olunan fənlərin ixtisasa uyğun olduğunu, 75 %-i müəllimlərin öyrətmə bacarığı və tələbələrlə davranışının müsbət olduğunu, 65 %-i universitetin əmək bazarına tam hazırladığını, 70 %-i şikayətlərin araşdırılması və fakültə tərəfindən onlara olan dəstəkdən razılığını, 90 %-i universitetdə heç bir etnik, dini, cinsi, mədəni ayrıseçkiliyə məruz qalmadığını, 60 %-i müəllimlərin dərsdə İKT və fərqli metodlardan istifadəsindən və dərs zamanı onların qiymətləndirməsindən razılığını, 60 %-i ADPU-nu digərlərinə məmnuniyyətlə tövsiyə edəcəyini və növbəti təhsil pilləsi üçün ADPU-nu seçəcəyini qeyd edir.

Abituriyentləri cəlb etmək və məzunlarla işi yaxşılaşdırmaq məqsədilə universitetdə açıq qapı günləri, tələbə-şagird əlaqələrini inkişaf etdirən layihələr və s. təşkil edilir.

ADPU-da monitorinq və sorğuların aparılması və təhlili mədəniyyəti formalaşmışdır. Universitetdə keyfiyyətlə bağlı uğursuzluqların və çatışmazlıqların açıq şəkildə müzakirə olunduğu düşüncə mədəniyyəti formalaşmışdır. Buna nümunə kimi ADPU-da professor-müəllim heyətinin reytinq qiymətləndirilməsinin nəticələrinin Elmi Şurada geniş müzakirə edilməsini göstərmək olar. Belə ki, hər ilin noyabr ayında cari il üçün müəlllimin elmi, pedaqoji və sosial fəaliyyətlərini əks etdirən 72 meyar üzrə göstəriciləri elektron çəkildə toplanır. Qiymətləndirilmə həm illər üzrə, həm də reytinq illəri üzrə aparılır. Bu zaman reytinq ili üzrə hesablama cari ilin 75%-i ilə keçən ilin 25%-nin cəmi şəklində hesablanır. Əldə edilən statistik məlumatlar müqayisəli şəkildə Elmi Şura üzvlərinə, o cümlədən müvafiq strukturlara təqdim olunur. 2018 və 2019-cu illər üzrə professor-müəllim heyətinin ballarının dəyişməsi ilə bağlı statistikanın müqayisəsinə əsasən, professor-müəllim heyətinin 72%-nin nəticələri artmışdır. 2021-ci ildə isə ADPU-nun kolleci və filialları da bu tədqiqatlarda iştirak etmiş və nəticələr emal olunmuşdur. Şəkildən göründüyü kimi 2018-ci ildən 2021-ci ilə qədər reytinq qiymətləndirilməsində müvafiq ballar üzrə müəyyən irəliləyiş və geriləmələr müşahidə olunur. Qeyd etmək lazımdır ki, 2020-ci ildə pandemiya səbəbindən qiymətləndirilmə aparılmayıb, amma 2021-ci ildə qiymətləndirmədə pandemiya ili nəzərə alınıb. Aşağıdakı diaqrama əsasən 10-100 bal aralığında azalma, 100-300 arası və 300-dən böyük balların statistikasında artımlar müşahidə olunur.




*ADPU -da professor-müəllim heyətinin topladığı reytinq balların müqayisəli statistikası*

ADPU üzrə professor-müəllim heyətinə tələbələr tərəfindən verilən ballara əsasən statistik məlumatlar aşağıda göstərilmişdir. Diaqramdan göründüyü kimi 2021-ci ilin reytinq qiymətləndirilməsində ballar aşağı düşmüş, lakin maksimum 30 bal alan müəllimlərin sayı artmışdır. Qeyd olunan aşağı enmələr qiymətləndirmədə ilk dəfə filial və kollecin akademik heyətinin qiymətləndirməyə qoşulması və ya tələbələrin sorğunu səmimi olaraq doldurulması ilə izah oluna bilər.




*ADPU üzrə professor-müəllim heyətinin tələbələrdən topladığı balların statistikası*

Reytinq qiymətləndirilməsinin nəticəsi olaraq 2018, 2019, 2021-ci illərdə uyğun olaraq 100, 156 və 160 müəllimə bir il ərzində əlavə 100 AZN məbləğində pul mükafatı verilmişdir. 100 baldan aşağı nəticə göstərən müəllimlərin nəticələrinin kafedralarda müzakirə olunması tövsiyə olunur.

Universitetdə elmi əsərlərin plagiatlığının yoxlanılması ilə bağlı akademik heyət və tələbələr arasında məlumatlanma işi aparılır. Universitetdə struktur vahidlərinin fəaliyyətinin təhlili və Elmi Şurada müzakirəsi mədəniyyəti də formalaşır. Hazırda ADPU-nun institusional qiymətləndirilməsi aparılır. İlk dəfə olaraq 2022-ci ildə ADPU-da Keyfiyyətin təminatı şöbəsi tərəfindən 38 keyfiyyət göstərici üzrə vahid sistem əsasında fakültələr, filial və kollecin institusional qiymətləndirilmə aparılıb. Prosesdə fakültə, filial və kollec üzrə qəbul olunan tələbələrin sayının qəbul planındakı saya faiz nisbəti araşdırılaraq, 98-100 %-lik uyğunluq müəyyən olunub, 2021-ci ildə bakalavr dərəcəsi alan tələbələrin sayının qəbul olan tələbələrin 2017-ci ildəki sayına nisbəti 71-75 % müəyyənləşdirilib. Həmçinin müəssisədə elmi seminarların müəllimlərin sayına nisbəti 91-95 faizdir. Bununla yanaşı, təhlil prosesində müəllimlərin işə qəbulu (MİQ) imtahanının test mərhələsindən keçən bakalavrların sayının ümumi məzun olan bakalavrlara nisbətinin 66-70 %, özəl təhsil müəssisəsində işləyən magistrların sayının ümumi məzun olan magistrlara nisbətinin 66-70 % olduğu müəyyənləşdirilib. Həmçinin doktorantların sayının müəllimlərin sayına nisbəti ən çox 31-35 %, işlə təmin olunmuş məzunların sayının ümumi məzunlara nisbəti ən çox 71-75 % nisbətində qiymətləndirilir.

# QƏBUL, TƏHSİL, QİYMƏTLƏNDİRMƏ

İnstitusional qiymətləndirilmənin aparılması prosesində, həmçinin indeksli jurnallarda illik nəşrlərin sayının (WOS, SCOPUS) ümumi nəşrlərin sayına nisbəti fakültələr üzrə araşdırılaraq, 21–25 %, WOS jurnallarında nəşr olunmuş əsərlərin istinad balının həmin əsərlərin sayına nisbəti isə ən çox 96–100 % olub. Beynəlxalq konfranslarda nəşr edilən əsərlərin (məqalə, tezis) sayının ümumi nəşrlərin sayına nisbəti isə ən çox 76–80 %-dir.




*2016/2017 - 2022/2023-ci tədris illərində ADPU-ya bakalavriat və magistratura səviyyələri üzrə qəbul olan təhsilalanların sayı (təkrar ali təhsil alanlar və əcnəbilər daxil olmaqla)*

## ƏMƏK BAZARININ TƏLƏBLƏRİNƏ UYĞUN OPTİMAL QƏBUL PLANI

Tədris illərinə görə əmək bazarının tələblərinə uyğun sifarişlərin hazırlanması və təkliflərin verilməsi zamanı ilk olaraq son illərin məzunlarının işlə təmin olunma statistikaları nəzərə alınır. Pedaqoji ixisasların məzunları, əsasən əmək bazarında aşağıdakı istiqamətlərdə fəaliyyətə başlayırlar:

- MİQ imtahanında iştirak edərək ixtisas yönümlü əmək fəaliyyəti
- Müxtəlif təhsil müəssisələrinin elan etdiyi müsabiqələrdə iştirak
- Magistratura və doktoranturada elmi və pedaqoji fəaliyyət
- Dövlət və özəl sektorda digər təşkilatlarda fəaliyyət

Müvafiq dövlət orqanları tərəfindən daxil olmuş proqnoz məlumatları əsasında gələcəkdə ehtiyac duyulacaq pedaqoji ixtisaslar üzrə (tədris dilləri də nəzərə alınmaqla), ölkə üzrə məşğulluq imkanları da nəzərə alınaraq, optimal tələbə qəbulu sifarişləri müəyyən edilir.

## QƏBUL PLANININ FORMALAŞMASINDA İŞƏ GÖTÜRƏNLƏRİN İŞTİRAKI

ADPU-nun fəaliyyətinin əsas istiqaməti pedaqoji kadr hazırlığı olduğu üçün sifarişçi qismində çıxış edən Elm və Təhsil Nazirliyidir. Hər il universitet üzrə qəbul planı proqnozlaşdırılarkən Elm və Təhsil Nazirliyinin müvafiq strukturları ilə qarşılıqlı müzakirələr aparılır.

## TƏHSİL PROQRAMLARININ ƏMƏK BAZARI VƏ CƏMİYYƏTİN TƏLƏBLƏRİNƏ UYĞUNLUĞU

2018-ci ildə ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi Fulbrayt proqramı çərçivəsində ADPU-ya ezam olunmuş ingilis dili mütəxəssisinin rəhbərliyi altında maraqlı tərəflərin iştirakı ilə "Xarici dil müəllimliyi (ingilis dili)" ixtisası üzrə təhsil proqramı, tədris planı və sillabuslar əmək bazarının ehtiyacları nəzərə alınmaqla və xarici dil (ingilis dili) müəllimi hazırlığının keyfiyyətinin artırılması məqsədi ilə yenidən işlənmiş və Elmi Şurada təsdiq edilmişdir. Universitetdə tətbiq olunan tədris planlarının ekspertizası əsasında əmək bazarının tələbləri nəzərə alınmaqla, həm bakalavriat, həm də magistratura səviyyələri üzrə tədris planlarında seçmə fənlər blokunun fənləri yeniləri ilə əvəz edilmiş və universitet EŞ-də müzakirə olunaraq təsdiq edilmişdir.

Pedaqoji Universitetdə müasir tələblərə və əmək bazarının ehtiyaclarına cavab verən kompetensiyalar əsasında və tələbəyönümlülük nəzərə alınmaqla işəgötürənlərin iştirakı ilə 2020-ci ildə bütün ixtisaslar üzrə yeni tədris planları hazırlanıb.

Eyni zamanda universitetdə aşağıdakı ixtisaslar üzrə SABAH qruplarında tədris aparılır.

| №-si | İxtisasın şrifti | İxtisasın adı |
|---|---|---|
| 1 | 050101 | Azərbaycan dili və ədəbiyyat müəllimliyi |
| 2 | 050107 | İbtidai sinif müəllimliyi |
| 3 | 050112 | Məktəbəqədər təhsil |
| 4 | 050115 | Riyaziyyat və informatika müəllimliyi |

Əmək bazarı və cəmiyyətin tələblərinə uyğun, beynəlxalq rəqabətə davamlı peşəkar kadr hazırlığını təmin edəcək yeni məzmun və təlim infrastrukturunun yaradılması və dayanıqlılığını stimullaşdırmaq məqsədilə universitetdə magistratura səviyyəsində 2021/2022-ci tədris ilindən "Biznesin təşkili və idarə edilməsi (təhsilin təşkili və idarə olunması)" ixtisaslaşması, 2022/2023-cü tədris ilindən "Marketinq (Təhsil üzrə marketinqin təşkili və idarə olunması)" ixtisaslaşması üzrə MBA proqramı, 2021/2022-ci tədris ilindən etibarən isə "Təlim və tədrisin təşkili və metodikası" ixtisaslaşması üzrə SABAH magistratura layihəsi üzrə kadr hazırlığı həyata keçirilir.



**Azərbaycan Respublikası Prezidentinin 16 noyabr 2018-ci il tarixli 711 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı"na müvafiq olaraq** ADPU və Corc Vaşinqton Universitetinin Ali Təhsil və İnsan İnkişafı Məktəbi arasında 25 iyun 2019-cu il tarixində imzalanmış Bəyannaməyə əsasən ikili diplom proqramı yaradılmışdır. 2019/2020-ci tədris ilində proqramın ilk qəbulu (25 magistr) həyata keçirilmişdir. Hal-hazırda proqrama son (2023-2024-cü tədris ili) qəbul həyata keçirilir. 2021/2022-ci tədris ilində ADPU-CVU ikili diplom proqramının ilk buraxılışı olmuşdur.




## TƏCRÜBƏLƏRİN TƏŞKİLİ

Qüvvədə olan tədris planlarına müvafiq olaraq bakalavriat səviyyəsində pedaqoji təcrübə 14 həftə ərzində normativ-hüquqi tələblərə uyğun rəsmiləşdirilir. İxtisasların spesifikasına uyğun olaraq ümumtəhsil və məktəbəqədər təhsil müəssisələrində, özəl təhsil müəssisələrində, sosial xidmət müəssisələrində, gənclər mərkəzlərində, Qeyri-hökümət təşkilatlarında istehsalat təcrübələri təşkil olunur. Coğrafiya müəllimliyi, Tarix və və coğrafiya müəllimliyi, Kimya və biologiya müəllimliyi, Biologiya müəllimliyi ixtisaslarında çöl təcrübələri Abşeron, Xızı və Şirvan Milli parklarında, Xıllı Nərə Balıqartırma Zavodunda, Neftçala Yod-Bron Zavodu və Sənaye məhəlləsinin zavodlarında, o cümlədən Neftçala Avtomobil Zavodunda təşkil edilir.

Magistratura səviyyəsində təhsil alanlar isə pedaqoji və elmi-tədqiqat təcrübələrini universitetin müvafiq kafedralarında və struktur bölmələrində keçirirlər.



## STAJKEÇMƏNİN TƏŞKİLİ VƏZİYYƏTİ

Universitetdə stajkeçmə professor-müəllim heyətinin təkmilləşdirilməsi, peşəkarlıq səviyyəsinin və əməyin keyfiyyətinin yüksəldilməsi, peşə bacarıqlarının formalaşdırılması, inkişaf etdirilməsi, nəzəri biliklərinin təcrübə ilə əlaqələndirilməsi, daha müasir peşə bacarıq və vərdişlərinin qazanılması, yeni texnologiyalar və innovasiyalar sisteminin tətbiqi üzrə təcrübə əldə etməsi məqsədilə müxtəlif problemlər üzrə Təlim-tədris mərkəzi, Davamlı təhsil və innovasiyalar bölməsi tərəfindən mütəmadi təlimlər keçirilir, beynəlxalq əməkdaşlıq çərçivəsində müxtəlif ixtisaslar üzrə mütəxəssislər dəvət olunaraq, akademik heyət üçün təlimlər təşkil olunur.

## SAĞLAMLIQ İMKANLARI MƏHDUD ŞƏXSLƏRƏ MÜNASİBƏTDƏ QİYMƏTLƏNDİRMƏ

Sağlamlıq imkanları məhdud şəxslərin əlillik forma və dərəcəsi nəzərə alınmaqla tədris prosesində və imtahan sessiyasında, əsasən yazılı və şifahi qiymətləndirmə üsullarından istifadə edilir.

## İMTAHAN SESSİYASI

Tələbələrin fənləri mənimsənmə səviyyəsi və keyfiyyət göstəriciləri cari, aralıq və dövlət attestasiyası zamanı müəyyənləşdirilir. Biliyin qiymətləndirilməsi 100 ballıq sistemlə aparılır. İmtahanlar, əsasən yazılı, şifahi və hibrid (xüsusi karantin dövründə və zəruri hallarda məsafədən) formada keçirilir. Tələbələr imtahan nəticəsi ilə bağlı narazılıqların araşdırılması və həll edilməsi üçün Apellyasiya Komissiyasına, imtahanların təşkili və imtahan prosesində yarana biləcək narazılıqların araşdırılması və həll edilməsi üçün isə İmtahan Qərargahına onlayn və əyani qaydada müraciət edə bilərlər. İmtahan prosesində şəffaflıq və ictimai etimadın gücləndirilməsi məqsədilə rektorun əmri ilə ictimaiyyət nümayəndələrindən ibarət İctimai Şura yaradılıb, həmçinin Tələbə Monitorinq Qrupu tərəfindən də imtahan prosesi izlənilir.



## QİYMƏTLƏNDİRMƏNİN MÜXTƏLİF FORMALARINDAN İSTİFADƏ

İxtisas və ixtisaslaşmaların spesifikasından asılı olaraq, fərqli qiymətləndirmə üsullarından istifadə edilir. Məşğələlərdə, əsasən yazılı tapşırıq, test, kompüter əsaslı test, şifahi təqdimat, sorğu, açıq müzakirə, layihə işlərinə dair hesabat, portfolionun qiymətləndirilməsi, frontal sorğu, qrup şəkilində qiymətləndirmə və özünüqiymətləndirmə üsullarından istifadə olunur.

Təlim prosesi ilə bağlı məmnunluq sorğularının nəticələri barədə kafedra və fakültə iclaslarında müzakirələr aparılır.

## QİYMƏTLƏNDİRMƏ VƏ TƏDRİS MÜHİTİNİN TƏKMİLLƏŞDİRİLMƏSİ

Universitet və fakültə elmi şuralarında hər semestrin imtahan sessiyasının sonunda bilik və bacarıqların qiymətləndirilməsi sistemi mütəmadi olaraq təhlil edilir, müzakirə olunur, proseslərin izlənilməsi və təkmilləşdirilməsi üzrə qərarlar qəbul olunur.




Tədris prosesi ilə bağlı tətbiq edilən normaların səmərəliliyinin izlənməsi məqsədilə monitorinqlər aparılır. Mühazirə və seminarlarda tapşırıqlar, müstəqil iş, araşdırma, video və audio mühazirələrin köməyi ilə əldə olunan təlim nəticələrini reallaşdırmaq üçün ağıllı lövhələr, kompüter və proyektorlardan istifadə edilir. Şəraitdən asılı olaraq tədrisin müxtəlif yollarla həyata keçirilməsi layihələşdirilir. Tətbiq edilən metodların səmərəlilik səviyyəsi mütəmadi olaraq qiymətləndirilir, fərqli qruplarda, fərqli fənlərdə fərqli metodlardan istifadə təşviq edilir. Metodların seçimindəki müstəqillik təhsilalanlarda müstəqillik hissini stimullaşdırır, müəllim və tələbə əməkdaşlığını inkişaf etdirir, tələbələrin tədris prosesinin qurulmasında fəal iştirakını təşviq edir. Tələbəyönümlü öyrənmə tələbələrə səlahiyyətlərini inkişaf etdirməyə kömək edir. Tədrisin belə təşkili əmək bazarında səriştəliliyi, rəqabətə davamlılığı, aktivliyi, vətəndaş məsuliyyəti ilə seçilən gələcək kadr hazırlığını təmin edir.

Müasir təhsilin əsas məqsədi tələbələrin zehnini hazır biliklərlə doldurmağa yox, gələcək müəllimlərin davamlı özünüidarəetmə və özünüifadəetmə, analitik təhlil qabiliyyətini, sərbəst düşünmə və qərar vermə bacarığını, verilən fakt, hadisə və proseslər arasında əlaqə yaratmaq və mənimsədiyi nəzəri bilik və bacarığı gələcək peşə fəaliyyətlərində tətbiq etmək bacarığını inkişaf etdirməkdir. Təlim prosesində qrupun ümumi öyrənmə səviyyəsi və tələbələrin fərdi xüsusiyyətlərinin nəzərə alınmasına çalışılır. Tələbələrə mühazirədən əvvəl materialların göndərilməsi öyrənmədə müsbət nəticə verir, interaktivlik təmin olunur. Tədris metodlarının keyfiyyəti və səmərəliliyi təlim nəticələrinin səviyyəsi ilə müəyyənləşir. Nəticədən asılı olaraq, tətbiq edilən metodun uyğun olub-olmadığı aşkar edilir, ona müvafiq preventiv tədbirlər görülərək, daha innovativ metod seçilir.

# YENİLƏNƏN İNFRASTRUKTUR

## İNFRASTRUKTUR





ADPU-da İnzibati departamentin tərkibində Təsərrüfat şöbəsi, Təhcizat və satınalmalar bölməsi və SƏTƏM bölməsi fəaliyyət göstərir. Departament ADPU-nun korpuslarında ("Səbail", "Gənclik", "Nəsimi", "Təbriz") təsərrüfat xidmətini həyata keçirir, liftlərin, işıqlandırma sisteminin, ventilyasiyanın (laboratoriyalarda) saz vəziyyətdə olmasını, əməkdaşların səmərəli işləməsi üçün zəruri şəraitin yaradılmasını təmin edir.

ADPU-nun maddi-texniki və tədris bazasına tədris laboratoriyaları, emalatxanalar, idman və akt zalları, tibb otağı, yeməkxana, təhsilalanlar və təhsilverənlər üçün mebel avadanlığı, informasiya-kommunikasiya texnologiyaları, audio-vizual avadanlıqlar, tədris-əyani vəsaitlər, təlimin texniki vəsaitləri, dərslik və elmi-bədii ədəbiyyat fondu və tədris-təcrübə sahəsi daxildir.

İnzibati departament ADPU-nun auditoriyalarında, yataqxana və yeməkxanalarında sanitar-gigiyenik vəziyyətə nəzarət edir.

Universitetin laboratoriyalarında tələbələrin laboratoriya işlərinin aparılması üçün lazımi şərait yaradılıb. Kimya və biologiya fakültəsində 24 və Fizika fakültəsində isə 22 tədris laboratoriyası fəaliyyət göstərir. ADPU-nun Şamaxı rayonunun Çuxuryurd kəndində yerləşən istehsalat təcrübə bazasında maliyyə çatışmazlığı səbəbindən təmir işləri tam yekunlaşmayıb.





## TƏLİM VƏ TƏDRİS RESURSLARI

ADPU-da Tədris İdarəetmə Sisteminin (LMS) qurulması üzrə fərqli platformalar üzərində işlər davam etdirilir və universitetin LMS-nin qurulması üçün imkanları gücləndirilir. Buna AR ETN-in ATİS sistemi, DİM-in Tələbə və Məzun Məlumat Sistemi, o cümlədən Microsoft 365, Moodle və s., əlavə etmək olar.

ADPU Microsoft Office proqramlarını gündəlik iş həyatında geniş istifadə edir. Microsoft 365-in ən mühüm üstünlüklərindən biri inzibati və akademik heyətin böyükhəcmli bulud saxlanca, təhlükəsizlik tədbirlərinə, eləcə də bir istifadəçi hesabı ilə bütün Office proqramlarına sahib ola bilməsidir. İstiadəçilər təqvimin təşkili, xatırlatmalar və görüləcək işlərin siyahıları ilə daha planlı işləyə bilirlər. Bundan əlavə Office proqramlarında ediləcək bütün yenilənmələri pulsuz əldə edir və tətbiqlərdə edilən təkmilləşdirmələrə anında sahib olurlar. Bu hesab vasitəsilə universitet tələbələri elektron kitabxana, Moodle tədris platforması və s. xidmətlərə giriş əldə edirlər.

Universitetdə distant təhsilin təşkili, əyani təhsilalma formasının daha da təkmilləşdirilməsi məqsədilə Moodle TİS (Tədrisin İdarəolunması Sistem) platforması tətbiq edilir (*e-learning.adpu.edu.az*).

ADPU-da müasir təlim prosesini aparmaq məqsədi ilə elektron lövhələrdən istifadə edilir. Universitet qısa müddətdə bütün auditoriyaları elektron lövhə ilə təmin etmək üzərində iş aparır. "MS Teams" məlumat paylaşımına imkan verən vahid mühitin təmin olunması ilə yanaşı, geniş kontent bazası kimi də istifadə olunur. Belə ki, bu gün "Microsoft Stream" vasitəsilə qeydə alınan mühazirələr bulud yaddaşda saxlanılır və o dərsləri müəyyən zaman ərzində təkrar izləmək imkanı vardır. Platforma onlayn dərs iştirakçılarına olduqları yerdən asılı olmayaraq, vahid virtual məkanda görüşmək, komanda quruculuğu imkanı verir.

Platforma milli təhsil sisteminə uyğun dəyişikliklərin edilməsi üçün uyğun hesab edilir.




Tədrisin təşkili prosesində elektron dərs resurslarından daha çox istifadə olunur. Müəllimlər tərəfindən hazırlanmış elektron təhsil resursları bazasının (e-Learning) tədris prosesinə inteqrasiyası məqsədilə tədris otaqlarının İKT resurslarının təkmilləşdirilməsi istiqamətində əsaslı işlər görülür.

## ƏHATƏLİ İNTERNET ŞƏBƏKƏLƏRİ, KOMPÜTER LABORATORİYALARI

Universitetdə akademik, inzibati və tədris otaqları da daxil olmaqla, ümumilikdə internetə çıxışı olan 600-dək kompüter vardır ki, onlardan 200-dən çoxu auditoriya və lobaratoriyalardadır. Tələbələrin İKT bacarıqlarını artırmaq, təlimdə tətbiq etmək bacarıqlarını formalaşdırmaq məqsədilə 120 internetə qoşulmuş kompüterdən ibarət 10 kompüter laboratoriyası fəaliyyət göstərir. İnternetin sürəti 300 mbit/san-dir.

ADPU-da kompüterlərlə təchiz edilmiş 3 tədris laboratoriyasından ibarət STEAM Mərkəzi yaradılıb. Qeyd edək ki, STEAM müstəqil fənn kimi Fizika müəllimliyi, Texnologiya müəllimliyi, Kimya müəllimliyi, Kimya və biologiya müəllimliyi, Biologiya müəllimliyi, Riyaziyyat müəllimliyi, Riyaziyyat və informatika müəllimliyi və İnformatika müəllimliyi ixtisaslarında tədris olunur.

## AUDİTORİYA FONDUNUN TƏLƏBƏ SAYINA NİSBƏTİ

ADPU-nun beş tədris korpusunda 87 mühazirə, 131 məşğələ, 50 tədris laboratoriyası olmaqla, cəmi 268 auditoriya mövcuddur. Auditoriyalar tədris istiqamətinə görə 55-75 nəfərlik (mühazirə auditoriyaları), 25-30 nəfərlik (məşğələ auditoriyaları), 13-15 nəfərlik (laboratoriya otaqları) şəklindədir. Bir tələbəyə 1,2 kv.m. faydalı sahə düşür.

## KİTABXANANIN XİDMƏT İMKANLARI

Universitetdə Kitabxana-İnformasiya Mərkəzinin beş tədris korpusunda kitabxanası, altı xidmət bölməsi və elektron kitabxana fəaliyyət göstərir. Kitabxanada dəqiq və humanitar elmlər üzrə, ədəbiyyatların növünə görə abonoment xidmətləri təşkil edilir. Beş tədris korpusundan dördündə ixtisaslaşmış xidmət bölməsi, oxu zalı və məlumat-biblioqrafiya xidməti fəaliyyət göstərirr. Əsas tədris binasında Avtomatlaşdırılmış Kitabxana İnformasiya Sistemi (AKİS) əsasında elektron kitabxana fəaliyyət göstərir. ***(e-library.adpu.edu.az).***




| | 2016/17 | 2017/18 | 2018/19 | 2019/20 | 2020/21 | 2021/22 | 2022/23 |
|---|---|---|---|---|---|---|---|
| Tələbə heyətinin sayı | 9806 | 9774 | 9836 | 9591 | 9764 | 9875 | 10770 |
| Akademik heyətin sayı | 721 | 724 | 752 | 779 | 739 | 742 | 728 |
| Nisbət | 13.06 | 13.5 | 13.07 | 12.31 | 13.21 | 13.3 | 14.79 |

Universitetin Kitabxana-İnformasiya Mərkəzinin ümumi fondu 746 min 221 nüsxə ədəbiyyatdan ibarətdir. Bunlardan 670 min 640-ı kitablardır. ADPU kitabxanası ölkəmizin ikinci ən böyük universitet kitabxanasıdır. Eyni zamanda kitabxananın fondunda 1000 nüsxəyə yaxın nadir və qiymətli kitablar və əlyazmalar qorunur.

ADPU-da ən müasir standartlara uyğun qurulmuş elektron kitabxana xidməti tələbələrin ixtiyarındadır. Hazırda Kitabxana-İnformasiya Mərkəzinin e-kataloqunda 12 min 818 adda 81 min 746 nüsxə kitab mövcuddur. Ötən il kitabxanadan 9 min 646 nəfər oxucu istifadə edib. İl ərzində 22 min 146 nüsxə kitab, 416 nüsxə dövri-elmi nəşrlər oxuculara verilib. Bu dövrdə 10 min 770 nəfər elektron kitabxanadan yararlanıb. Kitabxanaya daxil olmuş 7 min 382 sorğu müvafiq qaydada cavablandırılıb. Kitabxana fondunun daimi yenilənməsi də diqqət mərkəzindədir. Ötən il kitabxanaya 829 adda 3472 nüsxə yeni kitab, 18 elmlər doktorluğu və fəlsəfə doktorluğu dissertasiyası, 108 avtoreferat, 621 proqram, 22 adda 63 nüsxə dövri-elmi nəşrlər və jurnallar daxil olub. Kitabxana oxuculara xidmət etməklə yanaşı, mədəni-kütləvi tədbirlərin təşkili və təbliğinə, kitab mütaliəsinin populyarlaşdırılmasına da xüsusi diqqət ayırır.

## TƏDRİS DİLLƏRİNƏ UYĞUN KİTAB FONDU

Kitabxana-İnformasiya Mərkəzinin ümumi fondunda Azərbaycan dilində 19257 nüsxə, rus dilində 1350 nüsxə, ingilis dilində 3348, türk dilində 221 nüsxə, digər dillərdə 227 nüsxə dərs vəsaiti mövcuddur. Rus və ingilis bölmələri üzrə kadr hazırlığı xarici dildə dərs vəsaitlərinin artımına səbəb olmuşdur.

Universitet təhsil və elmi-tədqiqat sahəsində dünyanın ən nüfuzlu elmi jurnal və konfrans materialları ilə tanış olmaq məqsədi ilə "Tomson Reuters", "Clarivate Analytics" şirkətləri ilə əməkdaşlıq edir.





## SAĞLAMLIQ İMKANLARI MƏHDUD ŞƏXSLƏR ÜÇÜN TƏDRİS RESURSLARI

Sağlamlıq imkanları məhdud şəxslər üçün uyğunlaşdırılmış tədris resurslarının əldə edilməsi üzərində işlər aparılır. Qeyd edək ki, universitetdə "Korreksiyaedici təlim" təhsil proqramına uyğun kadr hazırlığı həyata keçirilir. İxtisas xüsusi tərtib edilmiş tədris planı və proqramlarla təchiz edilib. Tədris planında defektologiya, surdopedaqogika, oliqofrenopedaqogika, tiflopedaqogika, surdopsixologiya və loqopediya ilə bağlı fənlər daxil edilib. Bu fənlər peşəkar müəllimlər tərəfindən tədris edilir. Bakalavriat səviyyəsinin bütün ixtisaslarının proqramına İnklüziv təhsil və fərdiləşdirilmiş təlim fənni daxil edilib. Universitetin Gənclik tədris binasında Regional İnkişaf İctimai Birliyinin maliyyələşdirdiyi İnklüziv Təhsil Mərkəzi fəaliyyət göstərir.

# Tələbə həyatı

ADPU-da tələbələrin asudə vaxtının səmərəli təşkili, tələbələr arasında maarifləndirmə işinin aparılması, təhsilə marağın artırılması, tələbələrin hüquqlarının təmin edilməsi, Respublikanın daxilində və xaricində keçirilən müsabiqələrdə, olimpiadalarda, sərgilərdə, festivallarda istedadlı və yaradıcı tələbələrin iştirakının təmin edilməsi, universitet daxilində tələbələrin könüllülük fəaliyyətinin genişləndirilməsi məqsədilə Tələbə Gənclər Təşkilatı (TGT), Tələbə Həmkarlar İttifaqı Komitəsi (THİK), Təhsil Könüllüləri Tələbə Birliyi (TKTB), ADPU Könüllüləri Təşkilatı (ADPU KT), Meh Ədəbi Dərnəyi (MƏD), ADPU Türk Öğrenci Yönetim Konseyi (TÖYK) kimi tələbə təşkilatları və idman klubları fəaliyyət göstərir. Universitetdə bu qurumların fəaliyyəti üçün bütün zəruri avadanlıqlarla təchiz edilmiş otaqlar ayrılmışdır.

Universitetdə həm tələbə təşkilatlarının nəzdində, həm də müstəqil olaraq tələbə klubları fəaliyyət göstərir. TGT-nin nəzdində Tarix, Xarici dillər, Psixologiya, Kitab, Vətənpərvərlik, Sinema, İdman və sağlamlıq, ART, Elm və təhsil, Layihələr klubları, həmçinin "Buta" instrumental ansamblı; THİK-nin nəzdində Gənc yazarlar, Gənc intellektlər, Tarix, Qızıl əllər, Əyləncə və məntiq, Bio klublar; TKTB-nin nəzdində Musiqi, Rəsm, Qiraət, İntellekt, Media, Dil dərnəkləri; ADPU KT-nin nəzdində Kitab, Conversation, Vətənpərvərlik, Sinema, İdman, Elm və təhsil, Mədəniyyət, İntellektual Oyunlar klubları; Meh ədəbi dərnəyinin nəzdində Şairlər, Qiraətçilər, Musiqi, Rəssamlıq və əl bacarıqları, Motivasiya, Nasirlər bölmələri fəaliyyət göstərir.

Universitet tərəfindən bu klubların müxtəlif sosial layihələrinin, mədəni-kütləvi tədbirlərinin, eləcə də idman yarışlarının keçirilməsi üçün lazımi inzibati və təşkilati dəstək göstərilir, onların müsabiqələrdə iştirakı təmin edilir. Tələbə klublarının mədəni-kütləvi tədbirlərinin hazırlanması və həyata keçirilməsi üçün akt zalları, məşq otaqları, müxtəlif geyim, musiqi alət və avadanlıqları, idman fəaliyyətləri üçün stadion, geyim, geyinmə otaqları, müxtəlif idman qurğuları mövcuddur. Universitetdə tələbə klublarının, tələbələrin sosial, mədəni və idman fəaliyyətləri üçün resursların (inzibati və büdcə resursları) dəstək planları var.

Eyni zamanda tələbələrin təşkilatlar və fərdi qaydada ölkədə həyata keçirilən qrant müsabiqələrdə iştirakına, qazandıqları layihələrin təşkili və idarə olunmasına hərtərəfli metodik və praktik dəstək göstərilir. Ümumən tələbələrin sosial həyatlarına dəstək, hüquqlarının müdafiəsi və koordinasiya məqsədi ilə Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsi fəaliyyət göstərir.

## Psixoloji məsləhət xidmətləri

Universitetin dörd tədris korpusunda təhsilalanların psixoloji vəziyyətini, təhsil fəaliyyətini, sosial-mənəvi problemlərini öyrənmək və onlara psixoloji dəstəyin göstərilməsi, onların proqressiv psixi inkişafını, meyil, maraq və potensialının reallaşdırılması, habelə mümkün psixi pozuntuların profilaktikasını təmin etmək məqsədilə psixoloji məsləhət xidmətləri təşkil edilmişdir. Psixoloji məsləhətçilər iş qrafikinə görə fəaliyyət göstərirlər. Psixoloji məsləhətçilər təhsilalanların akademik nailiyyətlərinin artırılması, müsbət davranış modelinin formalaşdırılması, mənəvi-psixoloji sağlamlığının dəstəklənməsi, universitetdə təhlükəsiz və sağlam mühitin yaradılması, şəxsiyyətlərarası münasibətlərinin tənzimlənməsi ilə bağlı işlər aparırlar.

## Tələbə və məzunlarla mütəmadi rəy sorğuları

Son 7 ildə Universitetdə tələbə və məzunlar arasında qırxdan çox sorğu anketi keçirilmişdir. Sorğular əsasən şifahi, anket vərəqi və onlayn (Google Form) formatda, respondentlərin anonimliyi və konfidensiallığı gözlənilməklə aparılır. Sorğuların keçirilməsinin məqsədi dərs mühiti, kursun strukturu, məzmunu və müəllim həyəti və dərsdənkənar fəaliyyətlərinin təşkilidir. Məqsəd tələbələrin inkişafına dəstək olmaq və onların fikirlərini öyrənməkdir.

Təhsilalanlar arasında keçirilən sorğular:

- Universitetin ümumi fəaliyyətin qiymətləndirilməsi;
- Fənlər üzrə məmnunluq sorğuları.

Məzunlar arasında keçirilən sorğular:

- Karyera xidmətlərindən məmnunluq;
- Təhsil müddəti ərzində qazanılmış səriştələrdən məmnunluq;
- Qazanılmış peşə kompetensiyalarının əmək bazarının tələblərinə uyğunluğu;
- Qazanılmış ümumi kompetensiyalarının əmək bazarının tələblərinə uyğunluğu.

Ümumilikdə sorğular tələbə və məzun məmnunluq xarakteri daşıyır (80-89%) və keçirilən sorğuların nəticələri universitet EŞ-da, fakültə EŞ-da, kafedra iclaslarında müzakirə olunur. Sorğular tələbələrin tədris prosesinin idarəolunmasında iştirakına və tədris prosesinin keyfiyyətinin yüksəldilməsinə şərait yaradır.

Tələbə rəyləri sistemli şəkildə toplanır, təhlil olunur, aidiyyəti sahələr üzrə qruplaşdırılır, universitet və fakültə EŞ-də müzakirə olunur. Rəylərin obyektivliyinə görə istiqamət sahələri üzrə müvafiq tədbirlər görülür. Tədris prosesinin səmərəli təşkili, yeməkxana xidmətlərinin qiymətlərinin aşağı endirilməsi, kitabxanaya yeni dərslik və dərs vəsaitlərinin alınması və s. buna nümunə ola bilər.



## Təhsilalanların şikayət və ya təklifləri üçün müxtəlif imkanlar

ADPU-da təhsilalanların öz şikayət və təkliflərini sərbəst şəkildə bildirə bilmələri üçün şərait yaradılmışdır. Təhsilalanlardan daxil olan müraciətlər xarakterindən asılı olaraq operativ şəkildə cavablandırılır. Tələbələr şikayət və təkliflərini universitetin rəhbər heyətinin elektron poçtuna, fakültə və müvafiq struktur bölmələrə birbaşa müraciət etməklə, tələbə təşkilatları vasitəsilə universitetin rəsmi sosial media hesabları vasitəsilə, müraciətlər və şikayətlər qutusu vasitəsilə, rektor və prorektorların qəbuluna yazılmaqla bildirirlər. Təhsilalanların hər bir şikayət və təklifi təhlil olunur, müraciətlər operativ şəkildə müvafiq struktur bölməyə yönləndirilir, tələbə ilə əlaqə yaradılaraq müraciət cavablandırılır.

## Sağlamlıq imkanları məhdud şəxslərin cəmiyyətə inteqrasiyası

Müvafiq qanunvericiliyə uyğun olaraq, ADPU-da sağlamlıq imkanları məhdud şəxslərin cəmiyyətə inteqrasiyası meyarları tədris prosesində nəzərə alınır. Sağlamlıq imkanları məhdud şəxslərin təhsil hüququ təhsilin bütün səviyyələri üzrə digər şəxslərlə bərabər səviyyədə təmin edilir və onların təhsili üçün tədris prosesində əlverişli mühit yaradılmışdır. Tədris prosesində və imtahan sessiyası dövründə zəruri hallarda elektron sistemin imkanlarından istifadə olunur.

## Sosial həssas qrupa aid edilən tələbələrin təhsil xidmətlərinə əlçatanlığı

Ölkə qanunvericiliyinə və ADPU Nizamnaməsinə uyğun olaraq, ödənişli əsaslarla təhsil alan şəhid ailəsi üzvü olan tələbələr normativ təhsil müddətində təhsil haqqını ödəməkdən azad edilərək, onların təhsil haqlarının ADPU-nun hesabına ödənilməsi təmin edilir. Bundan əlavə ADPU-nun EŞ-nın müvafiq qərarı əsasında Vətən müharibəsində iştirak etmiş ADPU tələbələri alt qrup ödənişlərindən azad edilmişlər. Həmçinin sosial həssas qrupa aid edilən tələbələrin bir qisminin gündəlik qida xərcləri, nəqliyyat xərcləri, xüsusi karantin rejimində internet paket xərcləri THİK tərəfindən qarşılanır, yataqxana xidmətindən istifadə zamanı yerləşdirmədə onlara üstünlük verilir. THİK bu qismdən olan tələbələrə birdəfəlik yardım və təqaüd təyin edir.Tələbə təşkilatları və tyutorlar mütəmadi olaraq bu tələbələrlə ünsiyyətdə olur, onların problemləri həll olunur.

ADPU təhsilalanların təhsil xidmətlərinə əlçatanlığının təminatında, xüsusən də təhsil xərclərinin qarşılanmasında Azərbaycan Gənclər Fondu, Maarifçi Tələbə Kredit Fondu, Tələbə Təhsil Kredit Fondu da xüsusi rol oynayır.

## Geniş təqaüd imkanları

Dövlət sifarişi, dövlət hesabına və ödənişli əsaslarla təhsil almalarından asılı olmayaraq əyani təhsil alan tələbələrə təqaüd onların ümumi orta müvəffəqiyyət göstəricisinə (ÜOMG) görə təyin edilir.

Bundan əlavə Azərbaycan Respublikası Prezidentinin müvafiq Sərəncamına əsasən ölkədə yüksəkixtisaslı, peşəkar kadrların hazırlanmasına dövlət qayğısının artırılması və təhsildə yüksək nəticələr əldə edən tələbələrin təqaüd almaları üçün əlavə imkanların yaradılması məqsədilə ali təhsil müəssisələrində müvəffəqiyyət göstəriciləri əsasında dövlət hesabına maliyyələşən təqaüd yerlərinin sayı 2019/2020-ci tədris ilindən etibarən artırılmağa başlanılıb. Təqaüd yerlərinin sayı tədris illəri üzrə ixtisas və ixtisaslaşmalarda dövlət sifarişi ilə təhsil alan tələbə sayı və hər semestr rəhbər orqanlar tərəfindən müəyyən edilən əlavə təqaüd yerlərinin cəmi miqdarında müəyyən edilir. İmtahan sessiyasından sonra fakültələrdə tələbələrin həmin semestr üçün ÜOMG-nə əsasən (ən yüksək nəticə göstərənlər) təqaüd alanların siyahısı müəyyən olunur, tələbələrə elan edilir və fakültə elanlar lövhəsində paylaşılır.

Bundan əlavə universitetdə təhsil nazirinin əmrinə əsasən, 2017-ci ildən SABAH qruplarının tələbələrinə məqsədli təqaüd təyin olunur. 2014-cü ildən qəbul imtahanlarında 500-dən çox bal toplayan və ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edənlər Elm və Təhsil Nazirliyinin aylıq 100 manat məbləğində "Gələcəyin müəllim təqaüdü"nü almaq hüququ qazanırlar.

## Təqaüd yerlərinin artım dinamikası

| Təqaüdlərin statusu | 2016/17 | | 2017/18 | | 2018/19 | | 2019/20 | | 2020/21 | | 2021/22 | | 2022/23 | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Payız | Yaz | Payız | Yaz | Payız | Yaz | Payız | Yaz | Payız | Yaz | Payız | Yaz | Payız | Yaz |
| Dövlət təqaüdlərinin sayı | 4542 | 3533 | 5146 | 4307 | 5995 | 4960 | 6343 | 5774 | 6996 | 5278 | 7313 | 6394 | 6398 | 7008 |
| Əlavə təqaüd yerlərinin sayı | - | - | - | - | 1021 | - | 899 | - | 1100 | - | 720 | - | 294 | - |
| "Gələcəyin müəllimi" təqaüdlərinin sayı | - | - | 15 | 53 | 87 | 80 | 87 | 119 | 119 | 96 | 96/ | 137 | 137 | 142 |
| Adlı təqaüdlərin sayı | - | - | 10 | 10 | 10 | 10 | 10 | 10 | 10 | 10 | 10 | 10 | 11 | 13 |
| THİK-nın təqaüdlərinin sayı | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 | 5 |

## Adlı təqaüdlər

*ADPU-nun Elmi şurasının müvafiq qərarlarına əsasən, universitetə ən yüksək nəticə ilə qəbul olunan və imtahan sessiyalarında ÜOMG-si yüksək olan tələbələrə adlı təqaüdlər təyin olunur.*



# MƏZUNLARLA İŞ VƏ KARYERA İMKANLARI

Məzun koordinasiya və karyera şöbəsi təhsilalanların intellektual və mədəni inkişafı, peşəkar hazırlıq səviyyəsinin yüksəldilməsi ilə yanaşı, onların məşğulluq problemlərinin həll edilməsi üzrə kompleks təşkilati, texniki, informasiya, konsaltinq xidmətlərini həyata keçirir, onların əmək bazarına hazırlanmasında yaxından iştirak edir. Universitet təhsil və əmək bazarı arasında körpü rolunu oynayır.

## KARYERA MƏSLƏHƏT XİDMƏTLƏRİ

ADPU-da təhsilalanların təhsil ehtiyacları nəzərə alınmaqla karyera ilə bağlı məsləhətlərin və xidmətlərin göstərilməsi üç istiqamətdə həyata keçirilir:

• Birinci tədris ilinə qəbul olunmuş tələbələrin dil bacarıqlarının inkişafı sahəsində görülən tədbirlər
• Müəllimlərin İşə Qəbuluna (MİQ) hazırlıq məqsədi ilə görülən tədbirlər
• Universitetə dövlət və özəl təhsil müəssisələrindən daxil olan vakansiyalar əsasında işlə təminat

Təhsilalanlara yerli və xarici təhsil ekspertlərinin iştirakı ilə karyerayönümlü təlimlər, dəyirmi masalar təşkil edilir.



## MƏZUNLARIN ƏMƏK BAZARINDA İŞTİRAKININ İZLƏNİLMƏSİ

Universitetdə Məzun koordinasiya və karyera şöbəsi mütəmadi olaraq məzunların əmək bazarında fəaliyyətləri, karyera yüksəlişlərini izləyir. Bu məqsədlə məlumat bazası yaradılmışdır. Vaxtaşırı universitetdə məzunlarla görüşlər təşkil edilir, onların tövsiyə və təklifləri dinlənilib, nəzərə alınır.

## MƏZUN MƏMNUNLUĞUNUN ÖLÇÜLMƏSİ

Bu məqsədlə əyani və onlayn formada sorğular keçirilir. Əsasən sorğular məzun və işəgötürənlərlə aparılır, cavablar təhlil olunur, məzunların təhsil proqramı çərçivəsində əldə etdikləri səriştələrindən və təhsil proqramının keyfiyyət səviyyəsindən məmnunluğu müəyyən edilərək müvafiq fakültə və kafedralara istiqamətlənir. Bunun əsasında da müvafiq işlər planlaşdırılıb, monitorinq aparılır.

# İNSAN RESURSLARININ İDARƏ OLUNMASI

Son 7 ildə ADPU-da aparılan rasionallaşdırma və optimallaşdırma sayəsində universitetdəki 11 fakültə 8 fakültəyə, 45 kafedra isə 34 kafedraya endirilmişdir.

Hazırda ADPU-nun yeni strukturunda 1643 ştat mövcuddur. Onlardan 115 nəfəri inzibati idarəetmə, 599 nəfəri tədris-köməkçi, 675 nəfəri professor-müəllim heyətidir.



ADPU-da idarəetmə strukturunun optimallaşdırılması və insan resurslarının idarə olunmasında obyektivliyin və şəffaflığın təmin edilməsi üçün Müsabiqə Komissiyası yaradılmışdır. Universitetdə kadrların gəncləşdirilməsi məqsədilə ADPU-nu fərqlənmə ilə bitirmiş magistr, doktorant, dissertantlar və eyni zamanda xaricdə təhsil almış peşəkar gənclərin işə cəlb olunması istiqamətində tədbirlər görülür.

Məhz bu cür işçilərin sayəsində ADPU-nun kadr kontingentinin peşəkarlıq qabiliyyətini yaxşılaşdırmaq, idarəetmə sistemini təkmilləşdirmək, tədrisin keyfiyyətini yüksəltmək, müasirləşdirmək və bütövlükdə universitetin hərtərəfli inkişafına yönələn tədbirlər davam etdirilir.

Universitetin professor-müəllim heyətinin müasir dövrün tələbinə uyğun motivasiya sisteminin qurulması üçün Reytinq qiymətləndirilməsi sistemi yaradılmış, hər il reytinq qiymətləndirilməsi aparılmış və ən yaxşı nəticə toplamış ən azı 100 nəfər ADPU müəllimlərinin aylıq əməkhaqqına 100 manat əlavə hesablanmasına qərar verilmişdir. Həmçinin ADPU-nun müəllimlərinin bacarıqlarının artırılması istiqamətində universitet bir çox layihələr həyata keçirmişdir və bu iş hazırda da davam etməkdədir. Belə ki, Azərbaycan Dövlət Pedaqoji Universitetində və onun Şəki filialında tədris fəaliyyəti ilə məşğul olan ingilis dili müəllimlərinin Azərbaycan Müəllim İnkişafı Mərkəzi ilə razılaşdırılmış qaydada 2018-ci ilin əvvəllərindən etibarən əvvəlcə ingilis dilindən səviyyə müəyyənetmə testindən, sonra isə test nəticələrinə uyğun olaraq B2 və ya B1 səviyyələrindən yüksək nəticə toplamış 40 nəfər ADPU müəlliminə və 20 nəfər Şəki filialından olan müəllimə Kembric Müəllim Bilik Testi (TKT) üzrə Modul 1 təlimləri və sonda imtahanların keçirilməsi təmin olunmuşdur. Xarici Dillər Mərkəzinin 55 müəllimi yaxşı nəticələr toplayaraq müxtəlif səviyyələr üzrə yeni TKT sertifikatına layiq görülmüşlər.

2017-ci ildən bu günədək ADPU-nun 166 nəfər məzunu universitetdə işlə təmin edilib. Vətən müharibəsi şəhid və qazilərinin ailə üzvləri olan 5 nəfər işlə təmin olunaraq daimi qayğı ilə əhatə olunub. Universitetdə əməkdaşların maddi və mənəvi motivasiyasının yüksəldilməsi məqsədilə fəxri fərman və pul mükafatları verilir.

### 2017-2022-Cİ İLLƏR ÜZRƏ PUL MÜKAFATI ALAN İŞÇİLƏRİN SAYI




### 2017-2022-Cİ İLLƏR ÜZRƏ FƏXRİ FƏRMAN VƏ TƏŞƏKKÜRNAMƏ ALAN İŞÇİLƏRİN SAYI




### ŞƏFFAF İŞƏ QƏBUL PROSEDURU

ADPU-da akademik və inzibati heyətlə əmək müqavilələrinin bağlanılması və xitam verilməsi mövcud qanunvericiliyə və ADPU-nun Nizamnaməsinə uyğun həyata keçirilir.

ADPU-da yüksəkixtisaslı kadr potensialının təmin edilməsi, ixtisaslı mütəxəssislərin cəlb edilməsi, o cümlədən vakant vəzifələr üzrə müsabiqələrin təşkili və keçirilməsində şəffaflığı və obyektivliyi təmin etmək məqsədilə komissiya fəaliyyət göstərir. Komissiya ADPU-da idarəetmənin daha da yaxşılaşdırılması, tədrisin təşkili sahəsində qabaqcıl təcrübənin tətbiq edilməsi və tədris prosesinin keyfiyyətinin yüksəldilməsi, bütün struktur vahidlərində insan resurslarının idarə olunmasının təkmilləşdirilməsi, yüksəkixtisaslı kadr potensialının təmin edilməsi, habelə universitetin idarəetmə strukturunun optimallaşdırılması məqsədilə mövcud və gələcəkdə ehtiyac duyulacaq ixtisaslı mütəxəssislərin cəlb edilməsi, o cümlədən vakant vəzifələr üzrə müsabiqələr keçirir.

Vakant vəzifələr üzrə keçirilmiş müsabiqələrdə bütün namizədlərin iştiraklarına bərabər şərait yaradılır, vəzifələr üzrə uyğunluq qiymətləndirilir və seçki təşkil edilir. Akademik heyətin sayı təhsil səviyyələri üzrə təhsil proqramlarının effektiv həyata keçirilməsi məqsədilə ümumi dərs yükünə əsasən formalaşdırılır. Tətbiq edilən yanaşma şəffaf və ictimaiyyət üçün əlçatandır. Fakültə dekanı, kafedra müdiri, professor, dosent, baş müəllim və müəllim vəzifələrinin tutulması haqqında müvafiq elanlar dövri mətbuat orqanlarında və universitetin rəsmi saytında dərc olunur, seçkilərin nəticələri ictimaiyyətə açıqlanır.

### AKADEMİK HEYƏT ÜÇÜN SİSTEMLİ TƏLİMLƏR

Akademik heyətin texnoloji səriştələrinin artırılması məqsədilə keçirilmiş tədbirlərə (seminar, təlim və s.) cəlb olunmuşların ümumi payı 30 %-lə 40 % faiz arasında dəyişir. Bu da son illərdə İKT bacarıqlarına olan tələblərin artması ilə şərtlənir.

Pedaqoji səriştələrin artırılması üçün tədbirlərə cəlb olunmuş akademik heyətin ümumi akademik heyətdə payı 15-19 % arasında dəyişir. Bu təlim və seminarlarda, əsasən səriştələrin inkişafı, inklüziv təhsil yanaşması, effektiv idarəetmə, təhsildə liderlik kimi aktual məsələlər müzakirə olunur . Son iki ildə universitet tərəfindən pedaqoji səriştələrin artırılması üçün 20-dən artıq təlim təşkil edilmişdir.

Azərbaycanda ali təhsil sisteminin gücləndirilməsinə dəstək məqsədilə TVİNNİNG layihəsi çərçivəsində 2016-cı ildən 2020-ci ilədək Finlandiya, Fransa Estoniya, Latviya təhsil ekspertləri mütəmadi olaraq universitetin müəllim heyəti üçün "Ali təhsildə tələbəyönümlü yanaşma", "İnnovativ təlim və tədris metodları üzrə ustad təlimi", "İnnovativ təlim və qiymətləndirmə metodları üzrə ustad təlimi", "Əmək bazarı məlumatlarının təhsil ixtisasları qrupundan seçilmiş konkret ixtisaslar üzrə təhsil proqramlarında nəzərə alınması" mövzularında təlimlər təşkil olunub. Ümumilikdə son illərdə universitet müəllimləri üçün təşkil olunan beynəlxalq səviyyəli təlimlərdə Avstriya, Danimarka, Ukrayna, Belarusiya, Çin, Almaniya və Amerikadan olan mütəxəssislər iştirak etmişdir.

Ümumilikdə ixtisasartırma kurslarına, təlimlərə və ya digər kurslara cəlb edilmiş akademik heyətin ümumi akademik heyətdə payı 2021-2022-ci tədris ilində 35%-ə çatdırılmışdır.

### BEYNƏLXALQ PEŞƏKAR İNKİŞAF PROQRAMLARI

Akademik heyət eyni zamanda beynəlxalq səviyyəli mübadilə proqramlarında iştirak edirlər. Bunlar bir və ya iki həftəlik Erasmus+, DAAD (Müsəlman Dünyası ilə Ali Təhsil Dialoqu), dil kursları üzrə təcrübə və ixtisasartırma proqramlarıdır.

### MALİYYƏ İDARƏETMƏSİ

ADPU-nun maliyyələşməsinin əsasını dövlət büdcəsi vəsaiti, ödənişli təhsildən gələn gəlirlər və büdcədənkənar daxilolmalar formalaşdırır. Dövlət sifarişli təhsil alan tələbələr üçün dövlət büdcəsindən ayrılan vəsaitlərə əmək haqqı, dövlət sosial ayırmaları və tələbələrə verilən təqaüdlər aiddir. Digər gəlirlərə, yəni büdcədənkənar daxilolmalara ödənişli təhsil, təlimlərdən daxil olan ödəmələr, antiplagiat xidmətinin ödənişləri, kredit borclarından daxilolmalar, ADPU-nun yeməkxanasından daxil olan icarə haqqı, yataqxana xidmətindən daxil olan vəsaitlər aiddir. ADPU-nun işçilərinin əməkhaqqının minimum miqdarı Azərbaycan Respublikasının qanunvericiliyi ilə tənzimlənir. Büdcədənkənar mənbələrdən əldə edilən vəsait yalnız təhsilin inkişafına, müəssisənin maddi-texniki bazasının inkişafına, təhsilalan və təhsilverənlərin sosial müdafiəsinə yönəldilir. Göstərilən diaqramın nəticəsi olaraq qeyd etmək olar ki, universitetin maliyyə resurslarının rasional istifadəsinə xüsusi diqqət yetirilir. Gəlirin təxminən 15-20 faizi növbəti ilə keçir və bu da müəyyən dövrlərdə (pandemiya və qapanma) universitetin maliyyə dayanıqlığını saxlamağa imkan verir.

ADPU-nun gəlirlərinin artırılması haqqında strategiyaya əsasən, ödənişli təhsil haqqı gəlirlərindən əlavə olaraq, təlim kurslarından və digər xidmətlərdən (plagiat, yataqxana, yeməkxana, mətbəə və s.) olan gəlirlərin artırılmasının mümkünlüyü qarşıda duran vacib məsələlərdən biridir.

### DİFERENSİAL ƏMƏKHAQQI

Strateji İnkişaf Planına uyğun olaraq, əməkdaşların maddi motivasiyasının yaxşılaşdırılması məqsədilə səriştə və nəticə əsaslı diferensiallaşdırılmış rəqabətqabiliyyətli əməkhaqqı və müxtəlif stimullaşdırıcı paketlər sisteminin yaradılması üçün əməkdaşların və professor-müəllim heyətinin illik fəaliyyətinin Reytinq Qiymətləndirilməsi ilə bağlı qaydalara əsasən, əməkhaqqına əlavələrin, maddi yardım və mükafatların verilməsi mümkündür. Diferensial əməkhaqqı sisteminin əhatə etdiyi akademik (daimi əsaslarla çalışan) heyətin ümumi akademik heyətdə payı haqqında danışarkən, əvvəlcə deməliyik ki, ADPU-da 2017-ci ildən reytinq qiymətləndirilməsi aparılır və hər il üzrə göstəricilər artır. 2020-2021-ci il üçün bu 22% təşkil edir.




2022 və 2023-cü illərdə ADPU əməkdaşlarının vəzifə maaşları hər il üçün 10% artırılmışdır.



# ELMİ-TƏDQİQAT STRATEGİYASI

ADPU-da elmi-tədqiqat işlərinin planlaşdırılması və reallaşdırılması Azərbaycan Respublikası Prezidentinin müvafiq sərəncamları ilə təsdiq edilmiş "Azərbaycan 2020: Gələcəyə Baxış" İnkişaf Konsepsiyası, "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" və "Elm haqqında Azərbaycan Respublikasının Qanunu"na uyğun olaraq həyata keçirilir.

Universitetdə 7 dövri elmi jurnal nəşr edilir (2016-cı ilə qədər cəmi 2 dövri elmi jurnal nəşr edilirdi), mütəmadi beynəlxalq və respublika səviyyəli konfranslar, konqreslər, simpoziumlar keçirilir. Son illərdə yeni kafedralar və Elmi Tədqiqat Mərkəzi yaradılmış, magistratura səviyyəsində yeni ixtisaslaşmalar üzrə kadr hazırlığına başlanılmış, elm və təhsil sahəsində beynəlxalq əməkdaşlıq genişləndirilmiş, Gənc Alimlər və Tədqiqatçılar Şurası, Elm Komissiyası fəaliyyətə başlamış, kitabxana müasir elmi-texniki tələblərə uyğun olaraq yenidən qurulmuşdur.

Elmi nəşrlərlə bağlı beynəlxalq reytinq göstəricilərinin yaxşılaşdırılmasına diqqət artırılmışdır. ADPU 2016-2018-ci illərdə elm sahəsində uğurlarına görə "Web of Science" elmi bazasının "Ən mütərəqqi Universitet" mükafatına layiq görülmüşdür:




Universitetdə çalışan professor-müəllim heyətinin Google Scholar bazasında şəxsi profilləri yaradılmış və ORCID identifikasiya nömrəsinin alınması təmin edilmiş, professor-müəllim heyəti üçün maarifləndirici təlimlər keçirilmişdir.

### Akademik heyətin elmi məqalələrinə istinadetmə və H indeksinin dinamikası

| | Riyaziyyat | Fizika | Filologiya | Kimya və biologiya | İbtidai təhsil | Tarix və coğrafiya | Məktəbəqədər təhsil |
|---|---|---|---|---|---|---|---|
| İ 10 indeks | 45 | 31 | 1 | 10 | 0 | 6 | 0 |
| H indeksi cəmi | 65 | 41 | 7 | 23 | 5 | 21 | 5 |
| Fakültələr üzrə cəmi istinad göstərici | 1376 | 874 | 69 | 392 | 6 | 309 | 14 |
| Fakültələr üzrə H indeksi olan əməkdaşların sayı | 17 | 9 | 5 | 9 | 3 | 9 | 5 |

ADPU-da 8 fakültə, 34 kafedra, Magistratura və doktorantura şöbəsi, Elmi-təşkilati şöbə, Elmi-Tədqiqat Mərkəzi (ETM), Kitabxana İnformasiya Mərkəzi, Nəşriyyat şöbəsi, Dissertasiya Şuraları, Tələbə Elmi Cəmiyyəti, Gənc Alimlər və Tədqiqatçılar Şurası fəaliyyət göstərir. 2016-2022-ci illərdə ADPU-da 100 problem üzrə 500-ə qədər mövzuda elmi-tədqiqat işləri yerinə yetirilmiş, tətbiqi və innovasiya xarakterli ən əhəmiyyətli 50-dən çox iş tədris prosesində praktik tətbiq hüququ qazanmışdır.

Yalnız 2022-ci ildə xarici ölkə dövri nəşrlərində 442 (17 impakt faktor göstəricili) olmaqla, 852 elmi məqalə, 38 monoqrafiya, 33 dərslik, 59 dərs vəsaiti, 177 proqram və metodik vəsait və s. nəşr olunmuşdur. 209 əməkdaş beynəlxalq və 150 əməkdaş respublika elmi konfranslarında iştirak etmişdir. 14 nəfər fəlsəfə doktorluğu və 4 nəfər elmlər doktorluğu dissertasiya işini müdafiə etmiş, 3 nəfər professor və 15 nəfər dosent elmi adı almışdır.

ADPU-da 2016-2022-ci illərdə professor-müəllim heyəti və elmi işçilər tərəfindən 194 monoqrafiya, 180 dərslik, 534 dərs vəsaiti, 1485 proqram və metodik vəsait, 4685 elmi məqalə (impakt faktorlu jurnallarda 213) nəşr olunmuşdur.

2016-2022-ci illərdə ADPU-nun 34 kafedra və ETM-də 541 problem üzrə, 2966 elmi-tədqiqat işi aparılmış, 318 elmi-tədqiqat işi tamamlanmışdır.

2016-2022-ci illərdə universitet əməkdaşları respublikada keçirilmiş konfranslarda 1293 məruzə ilə çıxış etmişdir. Son 7 ildə ADPU-da müxtəlif mövzularda 20 beynəlxalq, 47 respublika, 100-ə yaxın universitetdaxili elmi və elmi-praktik konfranslar keçirilmiş, 12 patent alınmışdır.







ADPU-da müxtəlif elm sahələrində yeniliklərin və innovasiyaların tədrisə tətbiqi, müvafiq ixtisaslar üzrə aparıcı mütəxəssislərin cəlb edilməsi və birgə elmi tədqiqatların aparılması məqsədilə AMEA-nın elmi təşkilatları və institutları, Elm və Təhsil Nazirliyinin elmi tədqiqat institutları, Latviya Universiteti, Ukrayna MEA Mexanika İnstitutu, Ukrayna Təhsil Menecmenti Universiteti, Qlazov Dövlət Pedaqoji İnstitutu (Rusiya), Bartın Universiteti, Kayseri Universiteti, Bolu Abant İzzət Baysal Universiteti, TED Universiteti, Yozqat Bozok Universiteti, Qazi Universiteti, Hacettepe Universiteti, EYUDER, Ankara Universiteti, Başkent Universiteti, Burdur Mehmet Akif Ersoy Universiteti, İqtisadi İnkişaf və Sosial Tədqiqatlar İnstitutu, Yıldız Texniki Universiteti, Ege Universiteti (Türkiyə) və bir çox beynəlxalq təşkilatla əməkdaşlıq edir.




## ELMİ-TƏDQİQAT FƏALİYYƏTİ

2016-2019-cu illərdə ADPU-da fəaliyyət göstərmiş 7 Elmi-Tədqiqat Laboratoriyasının (ETL) bazasında 2019-cu ildə Elmi-Tədqiqat Mərkəzi yaradılmışdır. ETL əməkdaşları 2016-2019-cu illərdə təlimlər həyata keçirmiş, dərslik, proqramlar, məqalə və tezislər çap etdirmiş, respublika və beynəlxalq səviyyəli konfrans və təlimlərdə iştirak etmiş, diplom və sertifikatlara layiq görülmüşlər.

2021-ci ildə ADPU-da pedaqoji kadr hazırlığında keyfiyyətin yüksəldilməsi ilə bağlı araşdırmanın aparılması Mərkəzin fəaliyyətində prioritet istiqamət olmuşdur. Bu məqsədlə ADPU-nun "Müasir təlim texnologiyalarının tətbiqinə əsaslanan yeni məzmunlu təhsil üzrə metodiki tədqiqatın aparılması, nəticələrə dair təkliflərin verilməsi və həyata keçirilməsi" adlı layihəsi Elm və Təhsil Nazirliyinin dəstəyi ilə icra olunmuşdur. Layihə çərçivəsində beynəlxalq təcrübənin və yerli təcrübənin öyrənilməsi üçün Türkiyə universitetlərində (Hacəttəpə Universiteti və İstanbul Universitetində tarix, coğrafiya fənlərinə dair – onlayn) və ADPU-da Tarix və coğrafiya fakültəsində tədris üzrə mövcud vəziyyət təhlil edilmiş, ehtiyaclara dair nəticələr müəyyənləşdirilmiş, professor-müəllim heyəti üçün elmi-metodik seminar və təlimlər keçirilmişdir.

2021 və 2022-ci illərdə Mərkəzin koordinatorluğu ilə Bakıda Türkiyənin İqtisadi İnkişaf və Sosial Araşdırmalar İnstitutu (İKSAD) ilə birgə "Elm və Təhsildə İnnovativ Texnologiyalar" III və V beynəlxalq simpozium-ları keçirilmişdir.

2022-ci ildə Mərkəz əməkdaşlarının apardıqları tədqiqatlara dair 5 kitab, 204 elmi, elmi-publisistik məqalə və 10 tezis Azərbaycan, Türkiyə, İspaniya, İtaliya, ABŞ, Kolumbiya, Qazaxıstan və Özbəkistanda nəşr edilmişdir. Həmçinin mərkəz əməkdaşları həmin ölkələrdə 77 beynəlxalq və 19 respublika elmi konfransda (cəmi 96) iştirak etmişlər.




## DÖVRİ-ELMİ NƏŞRLƏR

ADPU-da nəşr edilən 6 adda dövri-elmi jurnal Azərbaycan Respublikasında məqalələrin dərc olunması tövsiyə edilən dövri-elmi nəşrlərin (müxtəlif elm sahələri üzrə) siyahısına daxildir. Həmçinin Azərbaycanda və xaricdə fəaliyyət göstərən ali təhsil müəssisələrində və elmi-tədqiqat institutlarında təhsil alan magistrantların fizika-riyaziyyat və texnika elmləri, təbiət elmləri, humanitar və ictimai elmlər, pedaqoji-psixoloji elmlər sahələrində aktual elmi tədqiqat işlərinin nəticələrini əks etdirən məqalələr isə "Magistrant" dövri-elmi jurnalında nəşr edilir. Dövri-elmi nəşrlər Azərbaycan Respublikası Ədliyyə Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Jurnallara təqdim olunan məqalələr mütəxəssislərin gizli rəyi əsasında (müsbət olduğu təqdirdə) redaksiya heyətinin qərarı ilə çapa tövsiyə olunur. Dövri-elmi jurnallarda məqalələrin tərtibi ilə bağlı Azərbaycan və ingilis dillərində yazı qaydaları verilir. Jurnalların elektron variantları universitetin saytında yerləşdirilir




## QRANTLAR ƏSASINDA YERİNƏ YETİRİLƏN ELMİ-TƏDQİQAT İŞLƏRİ

Son 7 ildə ümumilikdə 4 beynəlxalq və 20-dək respublikadaxili qrant layihə icra olunmuşdur.

## ELMİN İNKİŞAFI FONDUNDAN MALİYYƏLƏŞMƏ

ADPU-da Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun maliyyə dəstəyi ilə 2016-2022-ci illərdə 8 qrant layihəsi üzrə elmi-tədqiqat işləri yerinə yetirilmişdir.

Universitetdə çalışan professor-müəllim heyətinin Google Scholar bazasında şəxsi profillərinin yaradılması məqsədilə maariflənmə aparılaraq, professor-müəllim heyətinin Google Scholar, Academia bazalarında şəxsi profillərin yaradılması, elmi məqalələrin müəlliflərinin identifikasiyası üçün beynəlxalq sistemdə, əməkdaşların daha öncə çap edilmiş, lakin internetdə olmayan məqalələrinin mövcud açıq akademik sistemlərdə yerləşdirilməsi üzrə davamlı işlər həyata keçirilir. Qeyd edək ki, ADPU-nun yalnız 62 professor-müəllim heyətinin Google Scholar bazasında elmi məqalələrinə istinadetmə sayı (son 7 il üzrə) cəmi 3045-dir. Onlardan 17 nəfərin məqaləsinə istinadetmə H indeksi 5-dən yuxarı olan professor-müəllimdir. 23 nəfərin məqaləsinə istinadetmə isə İ10 indekslidir (İ10 indeksi müəllifin ən azı 10 istinad almış məqalələrinin sayına bərabərdir).






Son 7 il ərzində ADPU-nun mütəxəssisləri tərəfindən 10 elmlər doktorluğu və 43 fəlsəfə doktorluğu dissertasiyası müdafiə edilmişdir. 19 professor, 45 dosent elmi adı alınmışdır.

## ELMİ-TƏDQİQAT FƏALİYYƏTİNDƏ VƏ TƏHSİLDƏ ANTİPLAGİAT SİYASƏTİ VƏ ŞƏFFAFLIQ

2017-ci ilin fevralında Universitet ilə Plagiat.PL MMC arasında bağlanmış müqavilə əsasında bütün magistr və doktorluq dissertasiyaları, ADPU-nun professor-müəllim heyətinin, həmçinin digər təhsil və elmi-tədqiqat müəssisələrinin mütəxəssislərinin elmi-tədqiqat işlərinin orijinallığı antiplagiat proqramı ilə yoxlanılır. Plagiat.PL MMC-nin Azərbaycan Respublikasındakı filialı Polşanın və Almaniyanın tərəfdaş universitetlərinin təcrübəsinə əsaslanan və dünyanın 20 ölkəsində, həmçinin Azərbaycanda, təhsilin keyfiyyətini daha da yaxşılaşdırmağa, elmi işlərdə akademik dürüstlüyün səviyyəsini artırmağa, plagiatı azaltmağa, müəllimlərin və tələbələrin plagiata görə məsuliyyətini artırmağa öz töhfəsini verir. Akademik plagiata qarşı mübarizə aparan beynəlxalq Plagiat.PL MMC şirkətinin StrikePlagiarism.com antiplagiat sistemində elmi işlərin yoxlanılması həyata keçirilir. Beynəlxalq şirkət Azərbaycanda, Avropa İttifaqında və MDB ölkələrində liderdir və dünya üzrə 700-dən çox universitet bu şirkətin xidmətlərindən yararlanır.






Belə ki, 2017-2023-cü illər ərzində 200 elmlər doktorluğu dissertasiyası, 865 fəlsəfə doktorluğu dissertasiyası, 273 kitab, dərslik və dərs vəsaitləri, 3216 magistr dissertasiyası, 653 buraxılış işi, 321 məqalə və 940 fərqli adda elmi işlər olmaqla, ümumilikdə 6468 işin yoxlanılması həyata keçirilmişdir.

## İNFORMASİYA İDARƏETMƏ SİSTEMİ

ADPU olaraq informasiya idarəetmə sisteminin yaradılması üzrə fərqli platformalar üzərində işlər davam etdirilir və universitetin LMS-nin (Tədris İdarəetmə Sistemi (TİS)) qurulması üçün imkanları gücləndirilir. Buna Elm və Təhsil Nazirliyinin ATİS, DİM-in Tələbə və Məzun Məlumat Sistemi, o cümlədən Microsoft 365, Moodle və s. əlavə etmək olar.

ADPU Microsoft Office proqramlarından gündəlik iş həyatında geniş istifadə edir. Microsoft Word tez-tez mətn və rəsmi mətnlər üçün istifadə edilsə də, Excel cədvəllər və hesablamalar üçün də ən böyük köməkçimizdir. Tədris prosesində təsirli təqdimatlar üçün Power Point proqramından da böyük dəstək alırıq. Bunlardan başqa bir çox başqa tətbiqlər ilə Microsoft proqramlarından istifadə tədris prosesini çox asanlaşdırır. Bir çox proqramlar blog yazılarında, animasiya təqdimatlarının hazırlanmasında və ya veb-saytın hazırlanmasında istifadə edilə bilir. Əvvəllər Office 365 olaraq Microsoft bütün proqramlarını bir paket altında toplayır, eyni zamanda bir hesab vasitəsilə daha asan giriş və idarəetmə təklif edirdi. 2020-ci ildə verdiyi qərarla bu proqramların hamısını Microsoft 365 adı altında toplayır və eyni imkanları təqdim etməyə davam edir.

ADPU Microsoft 365-in ən mühüm üstünlüklərindən biri olan inzibati və akademik heyət bulud saxlama qabiliyyətinə və təhlükəsizlik tədbirlərinə, eləcə də bir istifadəçi hesabı ilə Office proqramlarına sahib ola bilir. İstifadəçilər həmçinin təqvimin təşkili, xatırlatmalar və görüləcək işlərin siyahıları ilə daha planlı fəaliyyət həyata keçirir. İstifadəçilər Office proqramlarına ediləcək bütün yeniləmələri pulsuz əldə edə və tətbiqlərinizdə ediləcək təkmilləşdirmələrə anında sahib ola bilir.

Universitetin hər bir inzibati və akademik, o cümlədən tələbələri üçün Microsoft 365 hesab yaradılır. Bu hesab vasitəsilə univeristet tələbələri müxtəlif onlayn xidmətlərdən yararlana bilir. Belə ki, elektron kitabxana portalı, Moodle tədris platforması və s. xidmətlər yalnız Microsoft 365 hesabları vasitəsilə əlçatan olur.

### MÜƏLLİM ÜÇÜN ELEKTRON KABİNETLƏR




Universitetdə distant təhsilin təşkili, əyani tədrisalma formasının daha da təkmilləşdirilməsi məqsədilə Moodle TİS platforması tətbiq edilir. Qeyd edək ki, hazırda dünyanın 243 ölkəsindən 250 milyondan çox istifadəçi Moodle platformasından istifadə edir. Moodle platformasından istifadə, akademik heyətə tədris zamanı kurs materialları, çalışma və tapşırıqların istənilən vaxt əlçatan olması, tədris mühitinin asanlıqla təşkili, tədrisdə vaxt itkisinin qarşısının alınması, məsafədən səmərəli bir tədris mühitinin formalaşması və s. kimi üstünlüklər qazandırır. 2019/2020-ci tədris ilindən başlayaraq, qısa müddət ərzində Moodle platformasının qurulması və tətbiqi üçün fəaliyyət planı təsdiq edildi. Fəaliyyət planına əsasən I mərhələdə platformanın texniki olaraq quraşdırılması və sazlanması prosesi həyata keçirildi.

Tezliklə, platforma internet üzərindən **(e-learning.adpu.edu.az)** istifadəyə açıq elan olundu.

Növbəti mərhələdə platformadan istifadə qaydaları və mövcud funksionallığın istifadəçilərə çatdırılması üçün silsilə təlimlər təşkil edilib. Təlimlərdən sonra müvafiq fənn kursları üzrə müəllim kabinetləri yaradılıb. Hər bir univerisitet müəllimi və tələbəsi Microsoft 365 tətbiqi ilə avtomatik rejimdə Moodle tədris platformasına giriş əldə edir və sistemin verdiyi üstünlüklərdən yararlanır.






## MÜƏYYƏN SAHƏLƏR ÜZRƏ ARTIM DİNAMİKASI

| Məzmun | 2019/20 | 2020/21 | 2021/22 | 2022/23 |
|---|---|---|---|---|
| **İnternetə çıxışı olan kompüterlərin sayı** | 269 | 376 | 457 | 573 |
| **Korporativ antivirus proqram təminatı quraşdırılmış istifadəçi kompüterləri** | 0 | 223 | 326 | 341 |
| **İctimai açıq simsiz internet bağlantı nöqtələri** | 0 | 5 | 7 | 77 |
| **Elektron tədris platforması üzrə müəllim kabinetləri** | 53 | 157 | 185 | 189 |
| **Universitetə məxsus veb-saytlar** | 1 | 1 | 8 | 8 |
| **İnteraktiv lövhə ilə təchiz edilmiş auditoriyaların sayı** | 22 | 22 | 42 | 43 |
| **“Microsoft Azure”-də istifadəçi hesabları** | 16480 | 19223 | 21845 | 24694 |
| **Sertifikatlaşdırılmış telekommunikasiya qurğu və vasitələri** | 0 | 10 | 10 | 10 |
| **Kompüter laboratoriyaları** | 3 | 4 | 9 | 10 |
| **Tədris prosesində istifadə olunan proyektorlar** | 56 | 56 | 61 | 62 |
| **Daxili və internet şəbəkəsinin uzunluğu** | 7800 m | 9600 m | 12200 m | 51800 m |
| **Tədris binalarında internetin yekun sürəti** | 200 Mbit/s | 200 Mbit/s | 200 Mbit/s | 300 Mbit/s |

Bir çox auditoriyalar dərsin əyaniliyinin təmin olunması məqsədi ilə HD görüntü keyfiyyətli proyektorlar ilə təchiz olunub. Bundan başqa inzibati və akademik heyətin internet şəbəkəsinə əlçatanlığını təmin etmək məqsədi ilə bütün tədris binalarında şəbəkə xətlərinin örtük ərazisi əhəmiyyətli dərəcədə artırılmışdır. Sahil korpusunda simsiz şəbəkənin örtük ərazisi, inzibati binanın mövcud ərazisinin 100 %-ni əhatə etmişdir. Tədris binaları üzrə internet bağlantısının yekun sürəti 300 Mbit/s qədər artırılmışdır.

# İCTİMAİYYƏTLƏ ƏLAQƏLƏR

2006-cı ildə universitetin ölkənin kütləvi informasiya vasitələri ilə sıx əl-aqə-lərinin qurulması və universitetin mədəni-kütləvi, elmi-pedaqoji həyatının işıqlandırılması məqsədi ilə mətbuat və informasiya şöbəsi yaradılmışdır. 2016-cı ildə şöbənin adı dəyişdirilərək İctimaiyyətlə əlaqələr və marketinq adlandırılmışdır. 2021-ci ilin mart ayında ictimaiyyətlə əlaqələr və marketinq şöbəsinin tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinə birləşdirilməsi nəticəsində daha geniş səlahiyyətlərə malik Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsi yaradılmışdır. 2022-ci ilin sentyabrında təkmilləşdirmə işləri ilə əlaqədar müstəqil İctimaiyyətlə əlaqələr və marketinq şöbəsi yaradılmışdır.

Şöbə universitetin gündəlik fəaliyyəti, təhsil və beynəlxalq əməkdaşlıq sahəsində qazanılan uğurların kütləvi informasiya vasitələrində işıqlandırılmasını təmin edir, ADPU-nu yerli və beynəlxalq mədəni-kütləvi tədbir və layihələrdə təmsil edir, universitetin rəsmi sosial media hesablarını (feysbuk, instaqram, teleqram, yutub və s.) idarə edir, universitetin fəaliyyətinin təbliğinə dair çap materialları hazırlayır, rəsmi www.adpu.edu.az saytının məzmununu idarə edir və məlumatların mütəmadi yenilənməsini təmin edir, universitet həyatını kütləvi informasiya vasitələrində təbliğ edir, universitetin orqanı olan "Gənc müəllim" qəzetini nəşr edir və media monitorinqini aparır və s.

Şöbə əməkdaşları tərəfindən ADPU-nun 100 illik yubileyi ilə bağlı 3 kitab ("Pedaqoji Universitetin Qəhrəmanları (ensiklopedik toplu)". Bakı, ADPU, 2021, 304 s., "Pedaqoji Universitet. 100 ilin şahidləri. Fotoalbom". Bakı, ADPU, 2021, 216 s., "Pedaqoji Universitet. 100 il 100 fakt", Bakı, ADPU, 2021, 108 s.) hazırlanaraq çap olunmuş, universitet, filiallar, fakültələr və kollecin bukleti, ADPU haqqında məlumat jurnalı və broşürü və digər çap və reklam vasitələri hazırlanmışdır.

İctimaiyyətlə əlaqələri və effektiv əks-əlaqəni təmin etmək üçün bir neçə operativ və dövri alətlərdən istifadə olunur:

## RƏSMİ SAYT

ADPU-nun rəsmi www.adpu.edu.az saytı Azərbaycan və ingilis dilində fəaliyyət göstərir. Saytın yenilənmiş versiyası 2022-ci ildə istifadəyə verilmişdir və saytda mütəmadi yenilənmə işləri davam etdirilir. Hazırda ADPU-nun əsas saytı ilə yanaşı, universitetin 8 fakültəsinin də saytları fəaliyyət göstərir.




Saytda universitetdə baş verən yeniliklər dəqiq və operativ şəkildə işıqlandırılır, əməkdaşlar, tələbələr və təhsil ictimaiyyətini maraqlandıran məlumatlar mütəmadi olaraq dərc olunur. Saytda həmçinin bütün strukturlar və əməkdaşlar haqqında aktual məlumatlar, əlaqə vasitələri yerləşdirilib.

## DİGƏR ƏLAQƏ VASİTƏLƏRİ

ADPU-da ictimaiyyəti məlumatlandırmaq və effektiv əks-əlaqəni təmin etmək məqsədi ilə rəsmi saytla yanaşı digər əlaqə üsullarından da hərtərəfli istifadə olunur. Burada aparıcı KİV-lə mütəmadi əməkdaşlıq, sosial şəbəkələrdən aktiv və effektiv istifadə, qəzet nəşri əsas yer tutur.

## "GƏNC MÜƏLLİM" QƏZETİ



Fəaliyyətlərin işıqlandırılmasında və tarixiləşdirilməsində universitetin mətbu orqanı - "Gənc müəllim" qəzeti mühüm rol oynayır. 65 ildir nəşr olunan "Gənc Müəllim" qəzeti 2021-ci ilin yanvar ayından etibarən yeni üslub və dizaynda rəngli formada çap və elektron qaydada dərcedilməyə başlanılıb. Yenilənmiş "Gənc Müəllim" istedadlı tələbələrin yazıları, Vətən müharibəsi şəhidləri, ADPU-nun məşhur məzunları haqqında silsilə maraqlı rublikalar təqdim etməklə yanaşı, innovativ qəzetçiliyi də tətbiq və təbliğ edir. Belə ki, 2021-ci ilin fevral sayından başlayaraq xəbərlərdə QR kod texnologiyası ilə lazımi məlumatlara - mətn, foto və videofayllara hiperistinadın verilməsi təmin edilir. Qəzet A3 formatında dərc edilir. İndiyədək 1120 nömrəsi dərc olunan qəzetin son 7 ildə 46 nömrəsi dərc olunmuşdur ki, bunların da 17-si son təkcə iki ildə dərc edilmişdir. Başqa sözlə son 7 ildə dərc olunan sayların 40 %-i son iki ildə çap edilən yeni formatlı "Gənc müəllim"in payına düşür.




## SOSİAL MEDİA İMKANLARI









ADPU-da ictimaiyyətlə əlaqələrin daha çevik və səmərəli təşkili məqsədi ilə 2020-ci ildən etibarən bütün aparıcı sosial media platformalarında universitetin rəsmi sosial media hesabları istifadəyə verilmiş, 2018-ci ildən mövcud olan feysbuk səhifəsi isə yenidən qurulmuşdur. Səhifələrdə korporativ stil tətbiq edilərək paylaşılan məzmunların keyfiyyəti və baxış sayları xeyli yüksəldilmiş, ADPU-nun bütün tələbələri, əməkdaşları və məzunlarını əhatə edən müasir operativ əlaqə vasitələrinə çevrilmişdir. Fərqli konseptdə və operativ fəaliyyət göstərən səhifələr tələbələr arasında böyük auditoriya toplamağa, feysbuk, instaqram, teleqram, və yutubda minlərlə real izləyici kütləsi toplamağa nail olub.

100 illik yubileylə əlaqədar olaraq yotub platformasında universitetin "ADPU TV" adlı onlayn televiziyası istifadəyə verilib. Davamlı fəaliyyətə başlayan bu layihənin müəllifləri, kanalın yayım və texniki heyəti şöbənin əməkdaşları və könüllü tələbələrdən ibarətdir. Kanalda təhsilə dair müxtəlif verilişlər və rublikalar hazırlanıb yayımlanır. O cümlədən, 2021-ci ildə 30 dəqiqəlik "ADPU Tanıtım filmi" hazırlanıb, yubiley ili boyu universitetin tarixini əks etdirən arxiv videoları təqdim olunub. Universitetin ictimaiyyətlə əlaqələrini inkişaf etdirmək məqsədi ilə sosial media marketinq (SMM) komandası yaradılmışdır. ADPU SMM komandasının rəsmi teleqram kanalına əlavə etdiyi "ADPUbot" süni intellekt botu ilə tələbələr onları maraqlandıran suallara cavab alırlar. Komanda üzvləri hazırda mobil tətbiqin hazırlanması üzərində iş aparır. Bot hazırda 229 suala cavab verə bilir və 2804 nəfər abunəçisi var.







Universitetin sosial media hesablarının izləyiciləri arasında xarici ölkələrdən olan istifadəçilər də yer alır. Ölkələr üzrə izləyici statistikası ölçülə bilən feysbuk şəbəkəsi üzrə statistika aşağıdakı kimidir:




Bunlarla yanaşı, universitet, şəhid tələbə və məzunlarımız, nəşrlərimiz və s. haqqında vikipediya açıq ensiklopediyasında mütəmadi yenilənmələr aparılır.

O cümlədən yubiley nəşrlərinin ictimai əlçatanlılığının təmini üçün "Internet Archive" platformasında Prezident Kitabxanası və Azərbaycan Milli Kitabxanasının elektron bazalarında yerləşdirilib.



# İCTİMAİYYƏTLƏ ƏLAQƏLƏR

KİV-lə əlaqələr son illərdə daha intensiv xarakter alıb. Universitetin fəaliyyəti müxtəlif informasiya agentlikləri tərəfindən müntəzəm olaraq işıqlandırılır. Daha çox əməkdaşlıq edilən və mütəmadi olaraq ADPU haqqında məlumatların dərc olunduğu KİV-in top 20-lik siyahısı belədir:

1. AzTV
2. İTV
3. Mədəniyyət tv
4. Space tv
5. AZƏRTAC
6. "Azərbaycan müəllimi" qəzeti
7. "525-ci qəzet"
8. Trend İnformasiya Agentliyi
9. Report İnformasiya Agentliyi
10. APA İnformasiya Agentliyi
11. Qafqazinfo.az
12. Mektebgushesi.az
13. Tehsil.biz
14. AZpress İnformasiya Agentliyi
15. Təhsil-press İnformasiya Agentliyi
16. Modern.az
17. Moderator.az
18. Onnmedia.az
19. Innews.media
20. Vetenim.az

ADPU-da tələbələrlə operativ əlaqənin təmini, ictimaiyyətin müraciətlərinin cavablandırılması məqsədi ilə rəsmi sayt, e-poçt, bütün sosial media hesabları, əlaqə nömrələri, kütləvi onlayn və əyani görüşlər vasitəsilə mütəmadi fəaliyyət göstərilir. Şöbəyə müxtəlif mənbələrdən daxil olan minlərlə müraciət əlaqədar şəxslər tərəfindən ən qısa vaxtda cavablandırılır və ya aidiyyəti üzrə yönləndirilir, lazımi tövsiyələr verilir. İctimaiyyətdən və KİV-dən ünvanlanan mütəmadi sorğular operativ qaydada cavablandırılır.






## İCTİMAİ NƏZARƏT, MONİTORİNQ

Rəsmi sayt və sosial media səhifələri vasitəsilə universitetin fəaliyyəti ilə bağlı maraqlı tərəflərə qiymətləndirmə və təhlil imkanı verən daimi aktual məlumat yayımı həyata keçirilir. Şöbə tərəfindən universitet haqqında ADPU-nun öz resursları və KİV-də yayımlanan məlumatların daimi monitorinqi aparılır və alınan nəticələrə əsasən müvafiq təkmilləşdirmə işləri ilə bağlı qərarlar qəbul olunur.




Mediada xəbər və mənbə sayının müqayisəli təhlilinə əsasən, 2016-cı ilə nisbətdə 2021-ci ildə yayımlanan xəbər sayı 575 %, xəbərlərin yayımlandığı mənbə sayı isə 1255 %, 2022-ci ildə isə müvafiq olaraq yayımlanan xəbər sayı 982 %, xəbərlərin yayımlandığı mənbə sayı isə 1970 % artmışdır.

Sistemli fəaliyyət nəticəsində, son iki il ərzində tələbələr və ictimaiyyət tərəfindən universitetlə bağlı müxtəlif kənar platforma və qurumlara edilən müraciətlər sıfır səviyyəsinə enmişdir. Sosial şəbəkə hesabları üzərindən ictimai rəyi öyrənmək, səhifələrin işini təkmilləşdirmək məqsədi ilə ADPU-nun sosial media hesablarının fəaliyyətindən məmnunluq haqqında onlayn sorğu keçirilib (Rəsmi Teleqram səhifəsi üzərindən, 08-09 fevral 2023). Rəyi soruşulanların (787 respondent) 76 %-i (602 respondent) səhifələrin fəaliyyətindən razı olduqlarını bildirmişlər.

### UNİVERSİTETİMİZİN SOSİAL ŞƏBƏKƏLƏRDƏKİ FƏALİYYƏTİNİ NECƏ QİYMƏTLƏNDİRİRSİNİZ?




# BEYNƏLXALQ ƏLAQƏLƏR

Təhsildə qloballaşma və beynəlmiləlləşmə faktorlarının olduqca mühüm əhəmiyyət kəsb etdiyi bir dövrdə ADPU da dünyanın müxtəlif ali təhsil ocaqları, həmçinin beynəlxalq şirkət və qurumları, müxtəlif ölkələrin ölkəmizdəki səfirlikləri ilə əlaqələrin yaradılması, inkişafı və genişlənməsi istiqamətində çalışır.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin beynəlxalq əlaqələr sahəsində fəaliyyəti Beynəlxalq əlaqələr üzrə prorektorluq tərəfindən koordinasiya olunur. Universitetin beynəlxalq əlaqələri aşağıdakı istiqamətlər üzrə qurulmuşdur:
1. Xarici universitet, təşkilat və mərkəzlərlə ilə əməkdaşlıq (Beynəlxalq əlaqələr şöbəsi)
2. Beynəlxalq layihələr və qrantlar (Beynəlxalq layihələr və qrantlar şöbəsi)
3. Əcnəbi tələbələrin qəbulu və tədrisi (Əcnəbi tələbələrlə iş şöbəsi)
4. Beynəlxalq və yerli təlimlərin təşkili və idarə olunması (Təlim-tədris Mərkəzi)
Universitetin beynəlxalq nüfuzunun artırılması istiqamətində dünyanın bir çox nüfuzlu təhsil müəssisələri ilə əməkdaşlıq əlaqələri qurulmuş, akademik heyət və tələbə mübadiləsi, beynəlxalq təlim və tədbirlər həyata keçirilir.

2016-2023-cü illər ərzində ADPU 66 əməkdaşlıq müqaviləsinə imza atıb. Onlardan 45-i ikitərəfli əməkdaşlıq müqaviləsi, 15-i Mövlanə Mübadilə Proqramı Protokolu, 6-sı ERASMUS+ KA1 müqaviləsi, 1-i isə ikili diplom proqramı çərçivəsində əməkdaşlıq müqaviləsidir.

## TÜRKİYƏ UNİVERSİTETLƏRİ İLƏ GENİŞLƏNƏN ƏLAQƏLƏR

ADPU-nun Türkiyə Universitetləri ilə sıx əməkdaşlıq əlaqələri vardır. 2016-2022-ci illər ərzində Türkiyənin 18 universiteti ilə ikili əməkdaşlıq müqaviləsi, 15 universiteti ilə Mövlanə Mübadilə Proqramı Protokolu imzalanmışdır.
2016-2017-cü illərdə 2 nəfər tələbə Mövlanə Mübadilə Proqramı çərçivəsində mobillikdə iştirak edib.
ADPU Beynəlxalq Türk Mədəniyyəti Təşkilatı (TÜRKSOY), Eğitim Yöneticileri ve Uzmanları Derneği (EYUDER) ilə mədəni əlaqələr, elmi araşdırmalar və təhsil sahələrində əməkdaşlıq edir, "Türk Dünyası Rəqəmsal Vətəndaşlığı" layihəsinin tərəfdaşıdır.

## MDB ÖLKƏLƏRİNİN UNİVERSİTETLƏRİ İLƏ ƏMƏKDAŞLIQ



2016-2022-ci illərdə universitet MDB ölkələri ilə əlaqələri genişləndirərək, 18 universitetlə ikili əməkdaşlıq müqaviləsi imzalayıb. Qazaxıstan və Rusiyanın ali təhsil müəssisələrinin nümayəndələri ilə görüşlər keçirilib. Rusiyanın Dövlət Humanitar Universiteti (RDHU) ilə anlaşma çərçivəsində tələbə mübadiləsi həyata keçirilib. Belə ki, RDHU-nun "Beynəlxalq əlaqələr" ixtisası üzrə təhsil alan 8 tələbəsi ADPU-da iki həftəlik yaz məktəbində iştirak ediblər. 11-14 noyabr 2021-ci ildə ADPU əməkdaşları Omsk Dövlət Universitetində Fyodor Dostoyevskinin 200 illik yubileyinə həsr olunmuş beynəlxalq konfransda iştirak edib.






## ABŞ SƏFİRLİYİ İLƏ BİRGƏ LAYİHƏLƏR




ADPU ABŞ-ın Bakıdakı Səfirliyi ilə əməkdaşlığı inkişaf etdirir, səfirliyin dəstəyi ilə müxtəlif proqramlar və layihələrdə iştirak edir. ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi "Fulbrayt İngilis dilinin tədris köməkçisi proqramı" çərçivəsində 2016-2023-cü illərdə 9 nəfər əcnəbi müəllim heyəti tədris prosesinə cəlb olunub. Cəlb olunan əcnəbi müəllimlər "İngilis dili müəllimliyi" ixtisası üzrə dərslərdə iştirak edir, tələbələr və şagirdlər üçün danışıq klubları təşkil edirlər. Pedaqoji Universitetdə ingilis dilinin tədris səviyyəsinin artırılması, Xarici Dillər Mərkəzinin akademik heyəti və ingilis dilində təhsil alan tələbərin xarici dil səviyyəsinin artırılması məqsədilə TKT VƏ CEPT imtahanları təşkil edilmişdir.
ABŞ Konqresi tərəfindən dəstəklənən 10 günlük "Açıq dünya (Open World) təlim proqramı" çərçivəsində ADPU-nun bir nəfər müəllimi ABŞ-da səfərdə olub.
ABŞ Dövlət Departamentinin hesabına Beynəlxalq Vizitorlar Liderlik Proqramının "İcma əsaslı məktəbəqədər təhsil" adlı multiregional təqaüd proqramı çərçivəsində ADPU-nun bir nəfər inzibati personalı ABŞ-da səfərdə olub.

## BEYNƏLXALQ ƏLAQƏLƏR

# ERASMUS+ PROQRAMI



Erasmus+

Beynəlxalq akademik mobilliyin inkişafı üzrə layihələrin icrası istiqamətində ADPU əlaqələrini genişləndirməkdə davam edir. 2016-2022-ci illərdə ERASMUS+ proqramı çərçivəsində 9 qrant layihəsi qazanılıb. Onlardan 4-ü Ali təhsildə potensialın gücləndirilməsi (KA2), 5-i Beynəlxalq Kredit Mobilliyi layihəsi çərçivəsindədir. ADPU ERASMUS+ KA1 çərçivəsində Danimarkanın Kopenhagen Universitet Kolleci, Litvanın Magnus Universiteti, Rumıniyanın "Dunarea de Jos" Galati Universiteti, Türkiyənin Bartın Universiteti və Polşanın Rzeszow Universiteti ilə mübadilə proqramı həyata keçirir. 2016-2013-cü illərdə ERASMUS+ KA1 çərçivəsində 18 nəfər tələbə, 18 nəfər müəllim və inzibati heyət mübadilədə iştirak edib, 7 nəfər əcnəbi müəllim mübadilə proqramı çərçivəsində ADPU-ya səfər edib. ADPU ERASMUS+ KA2 çərçivəsində 4 qrant layihəsinin tərəfdaşıdır. Layihələr çərçivəsində elm və təhsil sahəsində müxtəlif istiqamətlər üzrə ən yaxşı Avropa təcrübəsi öyrənilmiş, elmi əməkdaşlıq sahələri müəyyən edilmiş və geniş əməkdaşlıq şəbəkəsi qurulmuşdur:

**PETRA** (Azərbaycan universitetlərində təlim və tədrisin təkmilləşdirilməsi, 2017-2020) layihəsi çərçivəsində 3 təlim səfəri keçirilmişdir. Layihənin yekununda ADPU-da Təlim, tədris və resurs mərkəzi yaradılmışdır.
**EQAC** (Azərbaycan universitetlərində keyfiyyətin təminatı mərkəzlərinin yaradılması, 2017-2021) layihəsi çərçivəsində 6 təlim səfəri keçirilib və ADPU-da Keyfiyyətin təminatı şöbəsi yaradılıb.
**IQlinAR** (Azərbaycan və Rusiya ali təhsil müəssisələrində tədris, öyrənmə və qiymətləndirmədə təhsilin daxili keyfiyyət təminatının artırılması, 2021-2024) layihəsi çərçivəsində keçirilən 3 görüşdə ADPU-nu 3 nəfərlik layihə komandası təmsil edib.
**ECAR** (Azərbaycanda Rektorlar Konfransının Yaradılması, 2021-2023) layihəsi çərçivəsində keçirilən 5 təlim səfərində ADPU-nu 6 nəfər layihə komandası təmsil edib.
**DAAD** ilə ortaq layihə

ADPU "Müsəlman Dünyası ilə Ali Təhsil dialoqu" proqramı çərçivəsində Nürenberqin Fridrix Aleksandr Universiteti ilə "Pedaqoji Peşəkarlıq və Beynəlmiləlləşmə" adlı layihədə tərəfdaşlıq edir. Layihə çərçivəsində 2 təlim səfəri keçirilib.

## ƏCNƏBİ TƏLƏBƏLƏRLƏ İŞ

Pedaqoji Universitetdə təhsil almaq üçün əcnəbi vətəndaşların qəbulu təhsil sahəsində Azərbaycan Respublikası ilə xarici ölkələr arasında bağlanılmış müqavilələrə uyğun müəyyənləşdirilmiş kvota əsasında, Türkiyənin Ali Təhsil Şurasının (YÖK), Tələbə Seçmə və Yerləşdirmə Mərkəzinin (ÖSYM) imtahanlarının nəticələrinə əsasən, ADPU-nun əcnəbi vətəndaşlarla birbaşa bağladığı müqavilələr əsasında və Azərbaycan Respublikası Dövlət İmtahan Mərkəzi tərəfindən mərkəzləşdirilmiş qaydada keçirilən tələbə qəbulu müsabiqəsi əsasında həyata keçirilir.

2016-2022-ci illər ərzində YÖK imtahanlarının nəticələrinə əsasən, Hökumətlərarası Təqaüd Proqramı çərçivəsində, ADPU-nun əcnəbi vətəndaşlarla birbaşa bağladığı müqavilələr əsasında universitetdə təhsil almış 178 nəfər əcnəbi tələbə, 25 nəfər magistr, 9 nəfər doktorant, 128 nəfər əcnəbi dinləyici məzun olmuşdur. Hazırda 100-dək əcnəbi vətəndaş ADPU-nun hazırlıq, bakalavriat, magistratura və doktorantura səviyyələrinin müxtəlif ixtisaslarında təhsil alır. Onların arasında Türkiyə, Rusiya, Gürcüstan, Çin, Türkmənistan, Suriya, Ukrayna, Əfqanıstan, Pakistan və İran vətəndaşları vardır.




SIACAS
STUDY IN AZERBAIJAN: CENTRALISED ADMISSION SERVICE

Əcnəbi tələbələr studyinazerbijan.edu.az, SİACAS (portal.edu.az), həmçinin Əcnəbi tələbələrlə iş şöbəsinin rəsmi instagram və facebook səhifələri, həmçinin universitetin saytından istifadə edərək qəbul qaydaları haqqında məlumat əldə edə bilirlər.

## BEYNƏLXALQ TƏŞKİLATLARA ÜZVLÜK

ADPU dünyanın bir çox ölkələri ilə əlaqələri genişləndirir, bununla yanaşı bir sıra beynəlxalq təşkilatlara üzvlük edir. 2020-2021-ci tədris ilindən Qara Dəniz Universitetlər Birliyinin (BSUN), 2008-ci ildən Avropa Müəllim Hazırlığı Şəbəkəsinin (ETEN), 2017-ci ildən Universitet Prezidentlərinin Beynəlxalq Assosiasiyasının (İAUP) üzvüdür. Üzvlükdə məqsəd Avropanın müəllim hazırlığı ilə məşğul olan ali təhsil müəssisələri ilə əməkdaşlıq şəbəkəsi yaradaraq bilik mübadiləsi və mobillik imkanlarını genişləndirməkdir. Universitet EURAS, KÜNİB kimi təşkilatlarla yaxından əməkdaşlıq edir.















## İŞGÜZAR SƏFƏRLƏR

ADPU 2016-2022-ci illər ərzində rektorun iştirakı ilə 14 xarici səfərdə təmsil olunub. ADPU-nun üzv olduğu Avropa Müəllim Hazırlığı Şəbəkəsi (ETEN) tərəfindən İsveçin Gotenburq şəhərində yerləşən Gotenburq Universitetinin Təhsil fakültəsinin təşəbbüsü ilə keçirilən konfransda və Danimarkanın Kopenhagen şəhərindəki Universitet Kollecində (UCC) əməkdaşlıq çərçivəsində keçirilən görüşdə, Universitet Prezidentlərinin Beynəlxalq Assosiasiyasının (UPBA) Vyanada (Avstriya) keçirilən "Təhsildə İnnovasiya" adlı XVIII üçillik Konfransında ADPU-nun rektoru professor Cəfər Cəfərov iştirak etmişdir. Rektor prof. C.Cəfərov, həmçinin Türkiyədə keçirilən konfrans, forum və konqreslərdə (Vitse Kanslerlərin Forumu, Tükiyə və Azərbaycan ali təhsil sistemləri çərçivəsində əməkdaşlıq imkanları, KÜNİB VII Konqresi, Şeb-i Arus, EYFOR, EYUDER) iştirak edib. O cümlədən universitet rektoru Rusiyanın Moskva şəhərində keçirilən EDCRUNCH 2019 konfransında və Türkiyənin Ankara şəhərində 2022-ci il 7-11 noyabr tarixlərdə Qazi Universitetində Qarabağ zəfərinin ikinci ildönümü münasibətilə "Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!" adlı keçirilən tədbirdə iştirak edib. ADPU ABŞ-ın Vaşinqton şəhərində ARTN təşəbbüsü ilə ikili diplom məsələlərinin müzakirəsi barədə görüşdə və ADPU və ABŞ-ın Corc Vaşinqton Universiteti (CVU) arasında "Təhsil və insan kapitalının inkişafı" ixtisası çərçivəsində həyata keçirilən beynəlxalq ikili diplom proqramının rəhbər komitəsinin iclasında təmsil olunub.

## İKİLİ DİPLOM PROQRAMLARI




2019-2023-cü illər üçün Dövlət Proqramı əsasında həyata keçirilən ikili diplom proqramı çərçivəsində ABŞ-nin Corc Vaşinqton Universitetinin (CVU) "Təhsil və İnsan İnkişafı" məktəbi ilə birgə magistr ikili diplom proqramı həyata keçirilir. İki illik birgə beynəlxalq magistratura proqramı "Təhsil siyasəti və idarəetməsi" ixtisası üzrə həyata keçirilir. Proqrama ilk qəbul 25 nəfər olmaqla 2020-ci ildə olmuşdur. 2022-ci ilin iyununda proqramın ilk buraxılışı olmuşdur. Hazırda proqramda 60 nəfər tələbə təhsil alır.

CVU ilə birgə həyata keçirilən ikili diplom proqramı həm yerli, həm də beynəlxalq təcrübənin üstün cəhətlərini tətbiq edir. Beləliklə, tələbələr bu kimi beynəlxalq proqramda təhsil almaqla yanaşı, həm də yerli qanunvericilik mühitində beynəlxalq praktikanın tətbiqi imkanları ilə əyanı şəkildə öyrənmək imkanı əldə edirlər.

ADPU beynəlxalq ikili diplom proqramlarının sayını artırmaq məqsədilə Türkiyənin Qazi Universiteti ilə "Məktəbəqədər təhsil" sahəsi üzrə birgə proqramın icrası üçün hazırlıq görür. Bundan başqa, Litvanın Vytatus Magnus Universiteti ilə ikili diplom proqramlarının icrası üçün danışıqlara başlanılıb.

## FİLİALLARIMIZ İNKİŞAF YOLUNDA

# REGIONLARDA ƏLÇATAN ALİ TƏHSİL

## QUBA FİLİALI

ADPU-nun davamlı inkişaf siyasətində Quba filialının da önəmli yeri vardır. Filial 1943-cü ildə Quba Dövlət Müəllimlər İnstitutu kimi fəaliyyətə başlamış, 1991-ci ildən Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin Quba filialı, 2000-ci ildən Azərbaycan Müəllimlər İnstitutunun Quba filialı, 2015-ci ildən isə ADPU-nun Quba filialı kimi fəaliyyət göstərir.

Filialda 89 nəfər professor-müəllim heyəti çalışır ki, onlardan da 6 nəfəri elmlər doktoru (o cümlədən 1 nəfəri professor), 22 nəfəri fəlsəfə doktoru (o cümlədən 13 nəfəri dosent), 22 nəfəri baş müəllim, 35-i müəllimdir.



Hazırda 11 ixtisas üzrə qəbul aparılır. Son illərdə qəbul olunan abituriyentlər arasında 500 baldan yüksək nəticə göstərənlərin sayı çoxalır, hətta 670 balla filialı seçən abituriyent də var. Son 7 ildə tələbə sayı 779 nəfərdən 1064 nəfərə qədər artıb.

Tələbələrin sosial şəraiti, məzunlarla əlaqə mexanizmi daim təkmilləşdirilir. III tədris ilindən etibarən ixtisaslar üzrə ən yüksək bal toplayan tələbələrə 50 AZN məbləğində adlı təqaüdlər, filial üzrə III, IV və V tədris ili tələbələrindən ən yüksək bal toplayan tələbəyə isə 100 AZN məbləğində Heydər Əliyev adına adlı təqaüd təyin olunur. Tələbələrin asudə vaxtının səmərəli təşkili məqsədi ilə filialda TGT, TEC, THİK və bundan əlavə 15 tələbə klubu fəaliyyət göstərir.

Filialda idarəetmə və tədrisin keyfiyyətinə nəzarətin gücləndirilməsi məqsədilə Keyfiyyətin təminatı şöbəsi, Kitabxana və elektron resurslar şöbəsi, İnformasiya texnologiyaları laboratoriyası, Monitorinq və qiymətləndirmə üzrə baş mütəxəssis, Strateji məsələlər üzrə məsləhətçi, Beynəlxalq əlaqələr üzrə məsləhətçi, Təcrübə və məzunlarla iş üzrə rəhbər kimi struktur və vəzifələr təsis edilib. Həmçinin son illərdə Vətən müharibəsi iştirakçılarının və filial məzunlarının işə götürülməsi, işə davamiyyəti təkmilləşdirmək məqsədilə turniket sisteminin quraşdırılması, arxivin yenidən qurulması və elektronlaşdırılmasına start verilməsi də sürətli inkişafdan xəbər verir. AMEA Mərkəzi Elmi Kitabxanası ilə ADPU-nun Quba filialı arasında qarşılıqlı əməkdaşlığa əsaslanan Memorandum imzalanıb, elektron kitabxana istifadəyə verilib ***(adpuquba.edu.az/category/e-kitabxana).***

Bütün müəllim və təhsilalanlar üçün korparativ elektron poçt sistemi tətbiq edilmiş, "Moodle" virtual öyrənmə sisteminə yiyələnmələri məqsədilə təlimlər təşkil edilib. Filialda, həmçinin Avropa İttifaqı, UNİCEF, Heydər Əliyev Fondu və Elm və Təhsil Nazirliyinin dəstəyi ilə üçillik "Müəllimlərin inklüziv təhsil sahəsində bacarıqlarının təkmilləşdirilməsi" layihəsi icra olunub.

Professor-müəllim heyətinin "Web of Science" və "Scopus" elmi bazalarına daxil olan ən nüfuzlu nəşrlərdə beynəlxalq və Respublika səviyyəli konfrans materiallarında çap edilən məqalələrin sayı xeyli artmışdır, artıq filial beynəlxalq konfranslara ev sahibliyi edir. Filialda direktor f.e.d. Yusif Aliyevin təşəbbüsü ilə yaradılan Gənc Alimlər və Tədqiqatçılar Şurası elmi təşəbbüslərin stimullaşdırılması istiqamətində fəaliyyət göstərir. 2022-ci ildə filial əməkdaşlarının 14 monoqrafiya, 7 metodik vəsait, 4 dərslik, 4 kitab, 21 beynəlxalq konfrans məqaləsi, 27 Respublika səviyyəli konfrans məqaləsi, 12 publisistik məqaləsi işıq üzü görmüşdür. Filial son 3 ildə 5 beynəlxalq və 12 yerli elmi-praktiki konfransın təşkilatçısı olub.

Hazırda Quba filialı bir sıra xarici universitetlər və beynəlxalq təşkilatlarla səmərəli əməkdaşlıq edir. Bunlardan Polşanın Poznan Universiteti, Almaniyanın Rostok Universiteti, Özbəkistanın Termiz Dövlət Universiteti, Türkiyənin Ankara Universiteti və Qazi Universiteti, ABŞ-nin San Dieqo Dövlət Universitetinin Gürcüstan bölməsini, Qırğızıstanın Qırğızıstan Təhsil Akademiyasını, Şimali Kipr Türk Cümhuriyyətinin Girne Amerikan Üniversiteti, Qars Kafkas Universitetini, Türkiyə Qafqaz Universitetini, Kayseri Universitetini, Çankırı Gazi Mesleki ve Teknik Anadolu Lisesini göstərmək olar. Filialda keçirilən müxtəlif tədbirlərdə yerli və xarici mütəxəssislər yaxından iştirak edir.

ADPU-nun 100 illik yubileyi münasibətilə səmərəli elmi-pedaqoji fəaliyyətinə görə filial əməkdaşlarından 3 nəfər "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanı, 2 nəfər "Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri fərmanı" ilə təltif edilib. Filialda çalışan əməkdaşların sosial rifahları da ildən-ilə yaxşılaşdırılır. Filialda orta əməkhaqqı 2016-cı ildə 20%, 2018-ci ildə 10%, 2019-cu ildə 10% , 2019-cu ildə 17,5%, 2021-ci ildə 5,9%, 2022-ci ildə 16%, 2023-cü ildə isə 15 % artırılmışdır.

Tədrisin keyfiyyətinin yaxşılaşdırılması məqsədi ilə müəllimlər arasında 2020-ci ilin yanvar ayından Reytinq qiymətləndirilməsi tətbiq olunur. Son 4 ildə yeni iş otaqları, Heydər Əliyev lektoriyası, 200 yerlik böyük akt zalı, 75 nəfərlik auditoriya, şəhidlərin xatirə auditoriyalarının açılması, inzibati bina, həyət və yeməkxananın təmiri (Pedaqoji Kafe), yeni giriş-çıxış məntəqəsinin tikilməsi, meyvə bağının salınması, habelə son 7 ildə İKT infrastrukturunun cəmi 36 kompüterdən 99 kompüter, 9 ağıllı lövhə, 39 printer, 22 proyektor və motorlu lövhəyə qədər artırılması da davamlı inkişafın göstəricisidir.



## ŞAMAXI FİLİALI



Filial cəmiyyətdə müsbət imicə malik olaraq pedaqoji kadr hazırlığını uğurla aparır. 1991-ci ildən ali təhsil müəssisəsi kimi fəaliyyət göstərən Şamaxı filialına son illərdə qəbul olunan tələbələrin say və keyfiyyət tərkibində əsaslı dəyişikliklər baş verir. Belə ki, 2016-2017-ci tədris ilində filialda 5 ixtisasda 539 tələbə təhsil alırdısa, bu gün 7 ixtisasda 635 tələbə təhsil alır. Bu gün filiala qəbul olunan tələbələr arasında 600 baldan yüksək nəticə göstərən abituriyentlər də var. 2016-2022-ci illərdə məzun olmuş 754 nəfərdən 50%-dən çoxu ixtisası üzrə, bir qismi isə digər sahələrdə fəaliyyət göstərir.

ADPU-nun Şamaxı filialında qiymətləndirmə sistemi obyektivlik və şəffaflıq prinsipləri əsasında qurulmuşdur. Bunu imtahan sesiyalarında tələbələrin müvəffəqiyyət və keyfiyyət göstəricilərinin artan dinamikasında da görmək olar. Son 7 ildə müvəffəqiyyət faizi 60 faizdən 73 faizə, keyfiyyət isə 8 faizdən 16 faizə qalxmışdır. Filialda çalışan 44 nəfər professor-müəllim heyəti müxtəlif istiqamətlərdə elmi-tədqiqat işləri həyata keçirir. Onların arasında 2 elmlər doktoru, 9 dosent, 8 fəlsəfə doktoru, 6 baş müəllim və 23 müəllim var. 2016-2022-ci illərdə filial əməkdaşları tərəfindən 350-dən artıq beynəlxalq və respublika səviyyəli məqalə, tezis, 20-yə yaxın proqram, 15-ə qədər dərslik, dərs vəsaiti çap edilib. Filialın professor-müəllim heyətinin peşə bacarıqlarının artırılması üçün qoşulduqları "Teacher Activity Group Training Course as a part of the British Council's", "İnklüziv təhsilin genişləndirilməsi", "Beynəlxalq data bazalar", "İcma əsaslı məktəbəqədər təhsilin inkişafı", "Azərbaycanda genderə həssas təhsil sisteminin inkişaf perspektivləri", "STEAM fənninin tədrisi" və s. təlimlər tədrisin və elmi tədqiqat işlərinin müasirləşdirilməsinə xidmət edir.

Filialın beynəlxalq əlaqələri də genişlənməkdədir. 2017-ci ildə "III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumu", 2022-ci ildə İKSAD İnstitutunun filialla birgə təşkilatçılığı ilə keçirilən "V Beynəlxalq Elm və Təhsildə İnnovasiyalar konfransı", ELGER - Elm və Rədris Mərkəzinin təşəbbüsü və Qırğızıstan Milli Universitetinin filialla birgə "Elmin aktual problemləri: Türk dünyası və milli birlik çərçivəsində" 33-cü Beynəlxalq Elmi konfransının keçirilməsi elmi səviyyədə qurulan beynəlxalq əməkdaşlığın göstəricisidir. Filialın keyfiyyət təminatı siyasətinə onun Strateji inkişaf planına uyğun olaraq müəllimlərin tədris və elmi fəaliyyətinin stimullaşdırılması da daxildir. Son 7 ildə filialda əməkhaqqı 70 faiz artırılıb, müəllimlərin reytinq qiymətləndirilmə cədvəlinə uyğun diferensial əməkhaqqı sistemi tətbiq edilir, hər bir əməkdaş üçün mükafatlar, HİK xətti ilə mükafat və müalicə mərkəzlərinə göndərişlər verilir. Tələbələrin sosial rifahının yaxşılaşdırılması məqsədilə THİK tərəfindən sosial həssas və yüksək nailiyyətli tələbələr mükafatlandırılır. Son 3 ildə 7 tələbənin təhsil haqqı Gənclər Fondu tərəfindən, pandemiya dövründə sosial həssas qrupa daxil olan 244 tələbənin təhsil haqları dövlət tərəfindən ödənilmişdir.

Tələbələr eyni zamanda Tələbə Təhsil kreditindən də yararlana bilərlər. Son 7 ildə təqaüd yerləri 3 dəfə artırılmış, filialın adlı təqaüdləri təsis edilmişdir.

İşə qəbul prosesində filialı yüksək nəticələrlə bitirən məzunlara xüsusi diqqət göstərilir. Kadrların gəncləşdirilməsi siyasətinin nəticəsi olaraq, əməkdaşların 40 faizini gənclər təşkil edir.

Filialda fəaliyyət göstərən TEC və TGT öz işini tələbələrin xüsusi bacarıq və qabiliyyətlərinin aşkar olunması istiqamətində qurur. Son illərdə filial TGT-si 2 dəfə filiallar arasında keçirilən müsabiqədə "İlin TGT-si" mükafatına, təşkilatın sədri isə "İlin təşkilat sədri" nominasiyasına layiq görülüb. Tələbələr müntəzəm olaraq filialdaxili və qrant layihələrlə çıxış edir, regional və respublika səviyyələri yarışlarda, konfranslarda iştirak edərək uğur qazanırlar.






Filialın mövcud 25 auditoriyası müasir standartlara cavab verən texniki avadanlıq və fiberoptik internet xətti ilə təchiz olunmuş, kompüter, elektron lövhə, və proyektorlar quraşdırılmışdır. Filial kitabxanasında 32 minə yaxın kitab fondu var. Filialın saytında ADPU-nun elektron kitabxanasına giriş imkanı da yaradılıb ki, bu da tələbə və əməkdaşların elektron resurslara olan ehtiyacını ödəyir. Filialın rəsmi internet səhifələri vasitəsi ilə ictimaiyyətlə müntəzəm əlaqə qurulur.

FİLİALLARIMIZ İNKİŞAF YOLUNDA

# REGİONLARDA ƏLÇATAN ALİ TƏHSİL

## CƏLİLABAD FİLİALI



ADPU-nun Cəlilabad filialı fəaliyyətinə 2000-ci ildən Azərbaycan Müəllimlər İnstitutunun Cəlilabad filialı olaraq başlamışdır. 2015-ci ildən ADPU-nun filialı kimi fəaliyyət göstərir. Son 7 ildə filialda əsaslı inkişaf dinamikası izlənilir.

Filial ilk növbədə keyfiyyətli təhsil prinsipi ilə çıxış edir və təhsil bazarında mövcud olan rəqabət mühitində öncül yerlərə sahib olmaq üçün çalışır. Bununla əlaqədar Keyfiyyətin təminatı şöbəsi fəaliyyət göstərir. Şöbə təhsil müəssisəsinin fəaliyyətinin dövlət təhsil standartlarına uyğunluğu, səmərəli və müasir tələblərə uyğun tədris mühitinin yaradılması və onun fəaliyyətinin özünütəhlil əsasında davamlı inkişafının təmin olunmasına xidmət edən qiymətləndirmə sistemini həyata keçirir. Bunun üçün akademik heyət arasında Reytinq qiymətləndirilməsi aparılır, tələbələrin şikayətlərinə baxılması, təhlili və həlli ilə bağlı təkliflərin hazırlanması, anonim formada tələbələr arasında məmnunluq sorğusunun keçirilməsi, dərs prosesində daha müasir və interaktiv təlim metodlarının, habelə İKT-nin tətbiqi ilə bağlı müəllimlərin dərslərinin meyarlar əsasında izlənilməsi, tələbələrin metodik vəsait və mühazirə materialları ilə təmin edilməsi vəziyyəti və imtahanların təşkili və keçirilməsi ilə əlaqəli tələbələrlə sorğuların keçirilməsi, təhlili və təkliflərin hazırlanması və s. istiqamətdə işlər həyata keçirilir. Müfaviq illərdə filialdan bakalavr pilləsində 4 ixtisas üzrə 770 nəfər tələbə məzun olmuşdur. 2016-2022-ci illər ərzində filialda elmi potensialın gücləndirilməsinə xüsusi diqqət ayrılmışdır. Filialda fəaliyyət göstərən bir fakültədə birləşən kafedralarda və Elmi-tədqiqat və innovasiyalar şöbəsində elmi-tədqiqat fəaliyyətinin inkişafı istiqamətində bir sıra mühüm işlər görülmüşdür ki, bunlara nümunə olaraq kafedralar üzrə təşkil olunan 75 elmi-praktik seminar k, professor-müəllim heyəti tərəfindən 200-ə qədər elmi məqalənin (30-dan çoxu xarici jurnallarda) müxtəlif elmi jurnallarda çap edilməsi göstərilə bilər. Xaricdə çap olunan məqalələr əsasən ABŞ, Böyük Britaniya, Rusiya, Ukrayna, Türkiyə, Almaniya, Qazaxıstan, Cənubi Koreya və s. ölkələrdə çap edilmişdir. Filial əməkdaşlarının 3 proqram, 41 dərslik, dərs vəsaitləri, monoqrafiya və s. mühüm elmi əsərləri nəşr edilmişdir ki, onlardan üçü xaricdə çap edilən monoqrafiyalardır.



Filial AMEA-nın müxtəlif institutları, ADPU və onun filialları, BDU, LDU və s. ali təhsil müəssisələri ilə yaxından əməkdaşlıq edir. Hazırda kafedra əməkdaşları Moodle LMS platforması üzərindən tədrisin inkişaf etdirilməsi istiqamətində fəaliyyət göstərirlər. 2016-2023-cü illər ərzində kafedra əməkdaşları və kafedralardada müəllim kimi işləmək istəyən şəxslər haqqında informasiya bankı yaradılmışdır. Son illərdə kitaxana fondu yeni kitablar hesabına 7145-dən 10280 ədədə çatdırılmışdır.

Filialda sosial-ictimai fəaliyyət istiqamətində TEC, TGT, HİK və THİK, eləcə də Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin fəaliyyəti xüsusən diqqəti cəlb edir. Tələbələrin asudə vaxtının səmərəli təşkili, rayonun və ölkənin ictimai-siyasi, sosial həyatında iştirak istiqamətində davamlı işlər görülür. Belə ki, filialda müntəzəm olaraq vətənpərvərlik motivli, tolerantlıq və multikultural dəyərlərin formalaşdırılması yönümlü tədbirlər təşkil olunur. TEC-də birləşən tələbələr müntəzəm elmi-tədqiqat fəaliyyəti ilə məşğul olur, filialı Respulika səviyyəli tələbə konfranslarında təmsil edirlər. Hər tədris ilinin sonunda filialda TEC-in konfransı təşkil edilir. TGT nümayəndələri filialdaxili, rayon və Respublika səviyyəli mühüm tədbirlərdə uğurla təmsil olunurlar. Filialın aktiv tələbələri təmsil olunduqları tədbirlərdə sertifikat, medal, fəxri fərman, diplom və mükafatlara layiq görülürlər.

## AĞCABƏDİ FİLİALI



Filialın tarixi ötən əsrin 70-ci illərində fəaliyyətə başlayan və az sonra Xankəndi Pedaqoji İnstitutu kimi fəaliyyətinə davam edən ADPU-nun Xankəndi filialına dayanır. Ermənilərin məqsədli şəkildə törətdiyi separatçılıq nəticəsində institutun Azərbaycan bölməsi əvvəlcə Gəncə və Şuşada fəaliyyət göstərmiş, daha sonra artan erməni separatizmi nəticəsində Şuşada fəaliyyət göstərə bilməyən ADPU-nun Şuşa filialı müvəqqəti olaraq Ağcabədiyə köçürüldü. 2000-ci ildə Şuşa filialının bazasında Azərbaycan Müəllimlər İnstitutunun Ağcabədi filialı yaradıldı. Nəhayət, 2015/2016-cı tədris ilindən filial ADPU-nun Ağcabədi filialı kimi fəaliyyət göstərməyə başladı.

Filialın idarəetmə sistemində, eləcə də təlim-tədris fəaliyyətində başlıca meyar şəffaflıqdır. 2018-ci ildə filialın -2021-ci illəri əhatə edəcək 5 istiqamət üzrə Strateji İnkişaf Planı təsdiq olunub. Filialda struktur islahatları və kadrların gəncləşdirilməsi istiqamətində də mühüm addımlar atılır. Tədrisin idarə olunması, Tələbə və məzunlarla iş və Keyfiyyətin təminatı kimi şöbələrin yaradılması və effektiv fəaliyyətləri də buna misaldır. Son 5 ildə ixtisas sahələri üzrə 9 nəfər gənc müəllim və 7 nəfər bakalavr gənc müvafiq sahə üzrə bacarıq səviyyəsi yoxlandıqdan sonra işə qəbul olunub. Hazırda filialda bir fakültə və dörd kafedra fəaliyyət göstərir. Elmi potensial ümumilikdə 58 nəfərdən ibarətdir. Onlardan 12-si dosent, 16 nəfəri elmi dərəcəli müəllimlər, 9-u dissertantdır. 2018-ci ilə qədər elmi adlıların sayı 8 nəfər olmuşdursa, hazırda onların sayı 12 nəfərdir. Müəllimlərin respublika və beynəlxalq konfranslarda, filialdaxili və digər təlimlərdə iştirakı onların peşəkarlığının daimi artırılmasına öz töhfəsini verir. Filial əməkdaşlarından 4 nəfəri "Azərbaycan Respublikasının Qabaqcıl Təhsil işçisi" döş nişanı ilə, 1 nəfəri "Dövlət Qulluğunda fərqlənməyə görə" medalı ilə, 1 nəfəri "Vətən naminə" medalı ilə təltif edilib, 1 əməkdaş Fəxri Bədən Tərbiyəsi və İdman işçisi, Respublika dərəcəli hakimdir.

2020-ci ilədək 5 ixtisas üzrə tələbə qəbulu həyata keçirilirdisə, hazırda 9 ixtisas üzrə qəbul aparılır. Filialda 831 nəfər tələbə təhsil alır. Ötən illər üzrə qəbul nəticələri iki dəfədən çox artaraq 250 nəfərə çatıb. Məzunların fəaliyyəti də daim diqqət mərkəzində saxlanılır. Bu məqsədlə məzunların karyera yüksəlişi daim izlənilir. Filialda əməkhaqqıların artırılması və əməkdaşların sosial rifahına dəstək məqsədilə davamlı tədbirlər icra olunur. Əgər 2016-2017-ci tədris ilində ümumilikdə 9,64 % artım olmuşdusa, 2023-cü ildə bu rəqəm 21,2% təşkil edir. Sosial həssas qrupa aid əməkdaşlara filialın büdcəsindən və HİK tərəfindən maddi yardımlar ayırılır. Filialda yaradılmış şəffaf mühit imtahan sessiyalarında özünü daha bariz şəkildə büruzə verir. Sessiya müddətində İmtahan idarəetmə qrupu, İmtahan Qərargahı və Apellyasiya Komissiyası fəaliyyət göstərir.



Filialda tədrisin keyfiyyətinin yüksəldilməsində kitabxana əhəmiyyətli yer tutur. Daimi yenilənən elektron kitabxanada ümumilikdə 3236 resurs var. 2022/2023-cü tədris ilində filialın kitabxanası təmir olunmuş, geniş və işıqlı məkana köçürülmüş, sürətli internet xətti ilə təmin olunmuşdur. Kitabxananın "Kitab klubu" gənclərin kitab oxumağa həvəsini daha da artırır. Filialın internetə çıxışının yaxşılaşdırılması və əməkdaşların İKT bacarıqlarının artırılması məqsədi ilə hər birinin sürəti 2 meqabit olan 2 internet xətti son 7 ildə hər biri 4 meqabit sürətli 5 xəttə qədər çatıdırılıb. Filialda tam təchizatlı İnformatika, Riyaziyyat, STEAM kabinetləri fəaliyyət göstərir.

## ŞƏKİ FİLİALI



ADPU-nun Şəki filialı bölgədə mədəni həyatın inkişafında müstəsna əhəmiyyəti olan ali təhsil ocağıdır. 1991-2000-ci illərdə Bakı Dövlət Universitetinin, 2000-2015-ci illərdə keçmiş Azərbaycan Müəllimlər İnstitutunun filialı olaraq fəaliyyət göstərən müəssisə 2015-ci ildən ADPU-nun Şəki filialı kimi fəaliyyətini davam etdirir. 2022-ci ilin martında filialın 30 illik yubileyi təntənəli şəkildə qeyd olundu, bir çox əməkdaşlar fəxri adlar və diplomlarla təltif edildi.

Fəaliyyətinin ilk dövrlərində filialda yalnız 2 ixtisas üzrə qəbul aparılırdısa, qəbul aparılan ixtisasların sayı 2022-ci ildə 10-a çatdırılmışdır.

Filial 3,2 ha ərazidə 2 və 3 mərtəbəli yanaşı 2 binada yerləşir. Filialda tədrisin keyfiyyətini artırmaq və tələbələrin karyera yüksəlişinə dəstək vermək məqsədi ilə Keyfiyyətin təminatı şöbəsi və Karyera mərkəzi, habelə İnformasiya və kommunikasiya texnologiyaları şöbəsi fəaliyyət göstərir. Pedaqoji fakültə və Filologiya fakültəsində ümumilikdə 4 kafedrada elmi-pedaqoji heyət yüksəkixtisaslı kadr hazırlığını həyata keçirir.

Professor-müəllim heyəti 89 nəfərdən ibarətdir. Onlardan 3 nəfəri elmlər doktoru (o cümlədən 1 nəfəri professor), 14 nəfəri fəlsəfə doktoru (o cümlədən 9 nəfəri dosent), 44 nəfəri baş müəllim, 14 nəfər magistr, 25 nəfəri doktorant və dissertantdır. Son 5 ildə filial əməkdaşlarından 5 nəfəri fəlsəfə doktoru proqramı üzrə alimlik dərəcələri alıb. Filial əməkdaşlarından 60 nəfərə yaxını Respublikada, həmçinin ABŞ, Fransa və Portuqaliyada müxtəlif təlim kurslarından keçərək sertifikatlar alıb.



Professor-müəllim heyətinin xeyli uğurlu elmi-tədqiqat nəticələri əldə ediblər. Təkcə 2021-ci ildə filial əməkdaşları tərəfindən 4 dərs vəsaiti, 2 monoqrafiya, 61 məqalə (o cümlədən 9 məqalə xaricdə), 52 konfrans tezisi (o cümlədən 7-si xaricdə), 5 fənn proqramı nəşr olunub. Filialın professor-müəllim heyəti, əməkdaşları, gənc tədqiqatçıları və tələbələri Respublika və beynəlxalq səviyyəli elmi konfranslarda müntəzəm iştirak edirlər.

Filialın Respublikanın bir sıra ali məktəbləri ilə yanaşı ABŞ, Türkiyə, Rusiya, Fransa, Gürcüstan, Ukrayna, Qazaxıstan, Özbəkistan və s. kimi ölkələrin elmi müəssisələri ilə əməkdaşlığı var.



Filial 30 illik fəaliyyəti dövründə 4,5 mindən artıq müəllim kadrları hazırlayıb. Hazırda filialda 912 nəfər tələbə təhsil alır. Onlardan 10 nəfəri "Gələcəyin müəllimi" təqaüdü alır.

Filialda tələbələrin asudə vaxtlarının səmərəli təşkili məqsədi ilə elmi konfranslar, disput və debatlar, müsabiqələr keçirilir, TGT, TEC və THİK fəaliyyət göstərir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## ADPU SİZƏ ALİ TƏHSİLİN BÜTÜN SƏVİYYƏLƏRİNDƏ KEYFİYYƏTLİ MÜTƏXƏSSİS HAZIRLIĞI TƏKLİF EDİR

***Universitetdə bakalavriat və magistratura səviyyələrində əyani, doktorantura səviyyəsində isə əyani və qiyabi təhsilalma formalarında və dissertanturada kadr hazırlığı aparılır.***

### Bakalavr ixtisasları

Universitetdə 22 ixtisas üzrə kadr hazırlığı aparılır:

**I QRUP**
- Fizika müəllimliyi
- Texnologiya müəllimliyi
- Riyaziyyat və informatika müəllimliyi
- Riyaziyyat müəllimliyi
- İnformatika müəllimliyi

**II QRUP**
- Tarix və coğrafiya müəllimliyi
- Coğrafiya müəllimliyi

**III QRUP**
- Sosial iş
- Azərbaycan dili və ədəbiyyatı müəllimliyi
- Xarici dil müəllimliyi (fransız dili üzrə)
- Xarici dil müəllimliyi (ingilis dili üzrə)
- Tarix müəllimliyi
- İbtidai sinif müəllimliyi
- Məktəbəqədər təhsil
- Təhsildə sosial-psixoloji xidmət
- Korreksiyaedici təlim

**IV QRUP**
- Kimya müəllimliyi
- Kimya və biologiya müəllimliyi
- Biologiya müəllimliyi

**V QRUP**
- Musiqi müəllimliyi
- Təsviri incəsənət müəllimliyi
- Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi

### Magistr ixtisasları (ixtisaslaşmaları)

Universitetdə magistratura səviyyəsində aşağıdakı 22 ixtisas (28 ixtisaslaşma) üzrə magistr hazırlığı aparılır:

- Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası və metodologiyası
- Xarici dilin (ingilis dili) tədrisi metodikası və metodologiyası
- Fizika fənninin tədrisi metodikası və metodologiyası
- Riyaziyyatın tədrisi metodikası və metodologiyası
- Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fənninin tədrisi metodikası və metodologiyası
- Texnologiya fənninin tədrisi metodikası və metodologiyası
- Musiqi fənninin tədrisi metodikası və metodologiyası
- Biologiya fənninin tədrisi metodikası və metodologiyası
- Kimya fənninin tədrisi metodikası və metodologiyası
- Tarix fənninin tədrisi metodikası və metodologiyası
- Coğrafiya fənninin tədrisi metodikası və metodologiyası
- İnformatika fənninin tədrisi metodikası və metodologiyası
- Təsviri incəsənət fənninin tədrisi metodikası və metodologiyası
- İbtidai sinifdə tədrisin metodikası və metodologiyası
- Korreksiyaedici təlimin metodikası və metodologiyası
- Məktəbəqədər təlim və tərbiyənin metodikası və metodologiyası
- Təhsildə sosial-psixoloji xidmət
- Pedaqogika nəzəriyyəsi və tarixi
- Sosial pedaqogika
- Təhsildə qiymətləndirmə və monitorinq
- Təlim və tədrisin təşkili və metodikası (SABAH)
- Menecment (təhsilin təşkili və idarə olunması)
- Menecment (təhsilin təşkili və idarə olunması) – CVU ilə ikili diplom proqramı üzrə (ingilis dilində)
- Menecment (Ali təhsilin təşkili və idarə olunması)
- Həyat fəaliyyətinin müxtəlif sahələrində sosial iş
- Gənclərlə iş
- Biznesin təşkili və idarə edilməsi (Təhsilin təşkili və idarə olunması)
- Marketinq (Təhsil üzrə marketinqin təşkili və idarə olunması)



### Doktorantura ixtisasları

Universitetdə doktorantura səviyyəsində 33 ixtisas üzrə elmi dərəcəli kadrlar hazırlanır:

- Kompüter elmləri
- Diferensial tənliklər
- Yarımkeçiricilər fizikası
- Analitik kimya
- Üzvi kimya
- Zoologiya
- İnsan və heyvan zoologiyası
- İqtisadi coğrafiya
- Ümumi tarix
- Vətən tarixi
- Arxeologiya
- Azərbaycan dili
- Türk dilləri
- Azərbaycan ədəbiyyatı
- Dünya ədəbiyyatı
- Folklorşünaslıq
- Rus dilinin tədrisi metodikası
- Biologiyanın tədrisi metodikası
- İnformatikanın tədrisi metodikası
- Fizikanın tədrisi metodikası
- İngilis tədrisi metodikası
- Riyaziyyatın tədrisi metodikası
- Tarixin tədrisi metodikası
- Azərbaycan tədrisi metodikası
- Ədəbiyyatın tədrisi metodikası
- Kimyanın tədrisi metodikası
- Coğrafiyanın tədrisi metodikası
- Təhsilin təşkili və planlaşdırılması
- Müəllim hazırlığı və fəaliyyəti
- Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi
- Korreksiya pedaqogikası
- Pedaqoji psixologiya
- Ümumi psixologiya

www.adpu.edu.az







"Gənc müəllim" qəzetinin "Hesabat - İnkişaf yolunda" xüsusi buraxılışı ADPU-nun 2016-2022-ci illəri əhatə edən institusional akkreditasiya üzrə özünütəhlil hesabatı və universitetin filiallarının, müvafiq strukturlarının təqdim etdiyi məlumatlar əsasında hazırlanmışdır.

E-poçt: office@adpu.edu.az / Tel. (+994 12) 493 00 32
Azərbaycan, Bakı, AZ1000, Ü.Hacıbəyli küç., 68



*Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 858*

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.